# Molla Nəsrəddin



# ملّا نصرالدّین

Hazırladı: Cavid Ağa

اغآ دیواج :یدالرضاح

# ملّا نصرالدّین

№ 11 قیمتی ۱۲ قپك **МОЛЛА НАСРЕДДИНЪ** اوچونجی ایل ۱۱





Balkan işləri




... Yox, yox, haramdır ona qulaq asmaq: oradan cin səsi gəlir. (Ağdaşda)

О, пустите, пустите: тамъ черты поютъ... (Агдашъ)

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д.24.*

**Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.**

**Тифлисъ, "Молла Насреддинъ"**
**Редакция журнала "Молла Насреддинъ"**

**E'lan qiyməti**
**Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.**
**Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.**

**6 rəbiül-əvvəl 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 15 mart 1909**


# Акционерное Общество "ГРАММОФОНЪ"

***Тифлисское отделение***
***Головинский проспектъ, № 9.***




QRAMOFON



Tiflis, Qalovinski küçədə, nömrə 9.

Burada göstərilən fabrika nişanəsinə lazımdır diqqət eləmək. Hər bir qramofonumuzun və qramofon hissələrinin üstündə bu nişanə var.

Danışan maşinaların heç bir fabrikasının ixtiyarı yoxdur öz maşinalarına qramofon adı qoysun, ondan ötrü ki, qramofon məhz bizim patentli maşinalarımızdan ibarətdir.

**Qramofon** ........ev üçün ən gözəl bir məşğuliyyətdir.

**Qramofon** ........oxuyur, çalır, gülür və qeyrə.

**Qramofon** ........vasitəsilə evdə sazanda və oynamaq məclisi qurmaq olur.

**Qramofon** ........dünyada əvvəlinci danışan maşinadır və həmişə əvvəlinci olacaq.

Bizim maşinaların tə'rifi: mexanizmi sadə, möhkəm, çox yaşayan, zahiri gözəl və hamıdan vacib - təbii səsləri öz halətində çıxardır.

Dekabrın birindən ikitərəfli plastinkalar başlanıb satılmağa: xırdaları 75 qəpik, "qrand" adlıları bir manat 50 qəpik hər biri.

Məsləhət görürük aşağıda ad verilən çalğıçı və sazandaların çalıb-oxumaqlarına heç olmasa imtahan üçün qulaq assınlar: Məcid, Seyid, Bağrat, Məhəmməd Xəlilov, Məhəmmədqulu şuşalı, Məşədi Qafar iranlı, Hilal. Xanımlardan: Varvara, Anna. Skripkaçılar: Arşak və Əmircan. Tarzən Ohanes (kamança), Sivi Mirzəqulu (kamanca). Düdükçülər: Mirzəli Mirsadıqov. Zurnaçılar: Bağrat və Avetik və qeyrləri və qeyrləri.



Kataloqlar və siyahılar pulsuzdurlar!
Saxtalarından ehtiyatlı olunuz!



Novruz bayramında mürəttiblərimiz işləmədikləri səbəbindən məcmuəmiz iki gün yübandı.

## İSTİQBAL BİZİMDİR

Yetər, canım! Çəkil get, etmə çox təbxiri-hürriyyət,
Bizim qazqanda hərgiz oynamaz kəfgiri-hürriyyət.

Hanı dersən "girizandır vətəndən leyli-istibdad"?
Məgər görməzmisən ətrafı tutmuş xeyli istibdad?
Bu gün İranı yeksər qaplamışdır seyli-istibdad,
Yazıq! Ölçməkdədir xuni-cəhani keyli-istibdad,
Hələ Təbrizə də var iştəhayi-meyli-istibdad.
Yetər, canım! Çəkil get, etmə çox təbxiri-hürriyyət,
Bizim qazqanda hərgiz oynamaz kəfgiri-hürriyyət.

Demə "tiği-rəşadət xirəsazi-çeşmi-imkandır",
De kim təkfir üçün tiği-zəban hər yerdə bürrandır,
Deyən kafir müsəlmana sanır kəndin müsəlmandır,
Bu gün həq söyləyən hər kəs olursa küfrə şayandır,
Gözəl bir əsrdir, qəhti-şüurü əqlü vicdandır.
Yetər, canım! Çəkil get, etmə çox təbxiri-hürriyyət,
Bizim qazqanda hərgiz oynamaz kəfgiri-hürriyyət.



Mücahid qalxızıb dersən şükuhin mülki-İranın,
Buna təmkin edərmi çakərani şahi-zişanın,
Buna razı olarmı qeyrəti, namusu ə'yanın,
Bu yol bir şanlı qurbangahidir insafın, imanın,
Nə iman vaxtıdır, ancaq gözət xeyrin cibişdanın.
Yetər, canım! Çəkil get, etmə çox təxbiri-hürriyyət,
Bizim qazqanda hərgiz oynamaz kəfgiri-hürriyyət.



Əvət "Səhrayi-İran, doğrudan, bir odlu meydandır",
Fəqət, ol odlu meydanda duran bir şiri-qərrandır,
Vəli min hiyləgər tülküsifət hər yan nümayandır,
Batıb iranlılar nagah görərlər ölkə virandır,
Hələ qoy söyləsinlər də mücahid namüsəlmandır.
Hələ qoy eyləsinlər büsbütün təkfiri-hürriyyət,
Desinlər də bizə lazım deyil tə'miri-hürriyyət.



**Əbunəsr Şeybani**

# İRƏVANDA HACI ŞEYX ƏLƏKBƏR CƏNABLARINA

Heç bir yaranmış xətadan uzaq deyil. İndiyədək hər nə yazmışıq - doxsan doqquz dəfə haqq yazmışıq - bircə dəfə səhv eləməyimiz təəccüb deyil.

Bununla bərabər, təqsirimiz o dərəcə deyil idi ki, özgə qəzetədə bizim barəmizdə bir para artıq əskik sözlər yazasınız. Hərçənd 7-ci nömrədə müxbirimizdən rəvayətən sizin haqqınızda bə'zi nalayiq sözləri yazmışdıq. Lakin o sözləri yaza-yaza biz istəməmişdik inanaq və maarif dostlarından təhqiq və təsdiq istəmişdik və sora 9-cu nömrədə xəbər verdik ki, dəfəat ilə aldığımız çox şəxslər tərəfindən imza olunmuş məktublardan mə'lum olur ki, cənabınızın barəsində məcmuəmizə yazılan böhtandır.

Yə'ni haqq və sədaqət naminə biz öz yazdığımızı özümüz də rədd elədik. Halbuki bunu nə siz bizdən xahiş eləmişdiniz, nə sizin şikayətinizə görə hökumət bizi buna məcbur eləmişdi.

Budur mətbuatın şəraiti və məktubunuzu qəbul eliyən qəzetə gərək bunu mülahizə buyuraydı. Tutaq ki, məktub sahibi çox da nüfuzlu şəxsdir. Siz ilə uzun mübahisəyə girməyə haqqımız yoxdur, o səbəbə ki bu güft-guya bais biz olmuşuq, o səbəbə ki, namərd və vicdansız bir müsəlman ağızdan bir söz eşidib idarəmizə yazmaq ilə dilimizi lal eliyib.

Lakin izin versəniz, dəxi bu iki kəlmə ilə sözümüzü qurtarrıq.

Müzəxrəfatın üstündə heç vaxt "müzəxrəfat" yazılmır və çox vaxt axırda üzə çıxır ki, bə'zi cəvahirat ki bizə cəvahirat görsənirdi - onların cümləsi müzəxrəfat imiş.

Buna çox şahidlər və sübutlar gətirə bilərdik, amma yeri deyil.

**İdarədən**

# TELEQRAF XƏBƏRLƏRİ

**Bakı** - Novruz bayramı heç kəs ağzına bir şirni də almadı. Şirni pullarının hamısını yığıb Azərbaycanda yanan kəndlərin bədbəxt ac camaatına göndərdilər.

**Peterburq** - Tiflisin müsəlman casusları işlərində çox hünərli olmalarına görə, buranın "Əsl rus ittifaqı" firqəsi tərəfindən Peterburqa də'vət olundular.

**Buxara** - Əmir həzrətləri məktəb açdırmaqdan dəxi ürkməyir. Peterburqdan, İstanbuldan beş-on böyük müəllim çağırdı.

**Şamaxı** - Pir ziyarətinin fəsli yaxınlaşmağa görə camaat arasında böyük şadlıq görünür.

**Kaşğar** - Buraya İstanbuldan "Osmanlı fənn hey'əti" gəldi. Buradan Mancuriya, Sibir, Buxara, Qırğız tərəflərinə gedib həm fənni təftişdə bulunacaqlar, həm də oranın müsəlmanları ilə tanış olacaqlar.

**Gəncə** - Buranın müsəlmanları, maşallah, div addımı ilə geri-geri tərəqqi edirlər.

Müctəhid Molla Mə'suma və müridlərinə təqlid etmiyənlərin alınlarına lə'nət möhrü vurulur ki, tez tanınsınlar...

**Aşqabad** - Burada babilər üçün iki yüz min manata yapılan imarət oğlan və qız gimnaziyaları üçündür, nəinki məscid.

**Xivə** - Nəqşli əski daşları saxlamaq bütpərəstlik nişanəsi olduğundan əski türk əsərlərinin cümləsi murdar əcnəbilərə verilir.

**Axtı** - Bizim dağıstanlıların bir para igidləri e'lan edirlər ki, nərədə dar ağacına adam asmağa, ya adam boğmağa və ya siyasi müttəhimləri qamçı ilə döyməyə qulluqçu tapılmasa, biz ucuz qiymətlə hər yana getməyə və can ilə qulluq etməyə hazırıq.

**Kazan** - Buranın darülfünunundan bu il qırx yerli "tatar" şəhadətnamə ilə çıxacaq.

**Göyçay** - Məl'un şeytan axırda buraları da Ordubad şəhərinə bənzətməyə başladı.

Baş şeytanların adlarını sora yazaram.

**Misir** - Övc bin Ünqün sümüklərindən yapılan körpü uçdu.

**Tehran** - "Molla Nəsrəddin" jurnalına İrana dair şəkilləri qoydurmuyan Peterburq mə'murlarına şah həzrətləri öz mübarək şəklini hədiyyə göndərdi.

**Molla Nəsrəddin**

**Nə xoşbəxtlik!**

**Vladiqafqaz** - Böyük bir məclisdə şiddətli mübahisə oldu ki, hansı qəzetə müsəlman avamlarını mahiranə ovlamaq və müsəlman camaatının xoşuna gələn şeyləri yazmaq fəndini daha artıq bilir?

**Bakı** - Buranın atları müəllimlər məclisinə ərizə verdilər ki, bizim adımızı bundan sora yalnız "lər" ilə cəm etsinlər, "lar" ilə etməyə heç kəsin ixtiyarı yoxdur.

# MƏKTUB

Cənab Molla! Bəli, keçən həftə divanbəyi xüsusunda Qasım kənddən on iki nəfər imza ilə bizlərin sabiq məktubumuza rədd cavab yazmaların oxuduq. Bəli, su çeşmədən natəmiz gəlir. Hərgah biz tayfanın arasında yaxşıya yaxşı, yamana yaman deyilib insaf gözü ilə işə baxılmış olseydi, qorxu, tərəfdarlıq, dost-düşmənlik mülahizə olunmaseydi, işlər bu minval ilə olmazdı və haqq öz mərkəzində bərqərar idi. O on iki imzanın müqabilində bizlər üç on iki imza göstərməyə qadir idik və lakin alim və əşxasimətbuat dərd-səri olmadıq. Xudavəndi-aləm hər bir işə nazir və bəsirdir, xüsusən məzlumlar ahı, inşallah, biəsər olmaz. Yoxsa bizlərə nə lazım idi ki, nahaq yerə bir baabru olan şəxsi biabır edək və şəxsi-möhtərəm Mollaya dəxi məzahim olaq.

"Ta nəbaşəd çizəgi mərdom nəguyənd çizha".

**Qasımkənd ləzgiləri**

## ÇƏNGİ

Bəndə neçə vaxtdır Badkubədəyəm. Ancaq heç bir şey, bir əhval məcmuəyə göndərə bilmirdim. Çünki mənim "Molla Nəsrəddin" müxbiri olduğumu qoçular anlamışdılar, üstümdə gözətçi qoymuşdular. Bu günlərdə hər kəs məni görsə idi, gülməkdən qəşş edib ölərdi, çünki mənim tək fəqir, bir milçəyə əziyyət vermiyən adam belimə iki mauzer bağlıyıb küçələrdə gəzərdim. İndi işlər dəyişilib. Bakıya təzə bir qradanaçalnik qoyublar. Gələndən salıb tuthatutu, dustaqxana doludur qoçular ilə. Ələ keçmiyənlər də bir-bir şəhərdən qaçırlar. Dünən qalabəyinin yanında pasport yazan mənim dostum çıxdı qabağıma; nə surətdə? Tər alnından axır, dili ağzından bir qarış çıxıb, əlləri mürəkkəbə boyanıb. Soruşdum: yoldaş, nə var, nə işdi? Dedi: bəs bu iki gündə səkkiz yüz altmış yeddi qoçuya pasport yazmışam, taqətim kəsilib. Gedirəm yatam, dincələm və genə qayıdam dəftərxanaya pasport yazmağa. İndi görün nə qədər qoçu Bakıdan qaçır. Bunu görüb mən də qoçaqlanmışam, əlimə qələm alıb yazıram.

Badkubə şükr olsun allaha, bərk tərəqqi etməkdədir. İndiyədək toylarda görmüşdük mütrüb oynadardılar, indi bu bəd əməldən əl çəkib gürcü qızlarından təzə əmələ gəlmiş çəngilər gətirirlər və yaxşı da pullar yığılır. Məhərrəm qabağı Buzovna kəndinin əhli Hacı Məcid öz oğlunun toyuna iki dənə çəngi gətirmişdi; çəngilər toy üçün çox pul yığıblar; bu puldan toyun cəmi xərci çıxdı. Hətta Axund Molla Əbdüllətifin də kəbin kəsmək haqqı bu puldan çatdı.

Molla Əbdüllətif də bir qəribə molladı. Məhərrəm ayında bu zat üçün Məşədi Qərib məscidində yüz altı manat cəm olub və Mirəbdülsəməd ağa məscidində yüz manat cəm olub. Ancaq bu yüz manatı axund cənabları qəbul etmiyiblər, çünki Mirəbdülsəməd ağa məscidinin camaatı keçən orucluq bayramını Axund Əbdüllətifin sözü ilə etmiyib, bir özgə kənddən gəlmə Şeyx Cavadın sözü ilə ediblər. O səbəbə də hamısı kafir və mürtəd olublar. Söz yoxdur ki, çəngi pulu axundun sözünə baxmıyan mürtədlərin pulundan pakdır. Xülasə, allah axund ağanı Buzovna kəndinə çox görməsin və Mirəbdülsəməd ağanın məscidinin xalqını dinə gətirsin.

**Dəmdəməki**

## NOVRUZ

Novruzun bayram olub və ya olmadığı üstündə bu günlərdə bir məclisdə şiddətli mübahisə əmələ gəldi. Hətta az qalmışdı ki, yumruq döyüşü də düşsün. Məsələn, bir firqə bu e'tiqadda idi ki, bu gün Adəm peyğəmbərin tövbəsi qəbul olunub. Nuhun gəmisi sahili-səlamətə yetişib. İbrahimə od gülüstan olub. Yunis balığın qarnından xilas olub. Tərəfi-müqabil deyirdi ki: "Xeyr, buların hamısı iranlılar islamiyyəti qəbul elədikdən sora öz milli bayramları arada itməsin deyə qayırdıqları mövzu' hədislərdir". Bunun üstə məclisə bir hay-huy düşdü ki, az qaldı arada adam tələf olsun. Bəndənin rə'yinə görə novruz bayramı baharın əvvəlinə düşməkdə yaxşı bayramdır. Amma bunu anlıya bilmirəm ki, novruzun qabağındakı çaharşənbə gecəsində od yandırıb övrət-uşaqlar üstündən o tərəfə-bu tərəfə tullanmağının mə'nası nədir? Hərçi fikir elədim, bu müşkülü həll edə bilmiyib, sizə rücu' edib xahiş edirəm ki, zəhmət çəkib məcmuənizdə öz fikrinizi yazasınız ki, feyzyab olaq.

**Müxlisiniz Bikar**

## *Molla Nəsrəddin*

Çaharşənbə gecəsi od yandırmaq və üstündən tullanmaq çox vacib bir şeydir. Bu şərt ilə odun üstündən tullanan övrət-uşaqlar gərək tullandıqca bu duanı oxuyalar: "Ağırlığım-uğurluğum yerdə qalan üstünə".

## ERMƏNİLƏR

Molla əmi, mən ölüm, qulaq as, bir əhvalat sənə nağıl edim. Əşi, bu allahın ermənilərinə bax da, müsəlmanları yamsılıyırlar: keçən gün yığışıb bir qiraətxana açıblar. Axır bunlara bir deyən yox, ay səfeh uşağı səfeh, siz nə başarırsınız qiraətxana saxlamağı? Vallah, bax müsəlman dediyin dəli bir şeydir, acıdarsınız, hirslənib zor ilə qiraətxana açarlar ki, sizin babanız da görməmiş ola. Hələ qiraətxana qalsın kənarda, əşi, cavan ermənilərdən yığışıb ayda bir nə bilim, tatrun deyirlər, nə deyirlər, ondan oynuyurlar. Saki özlərini müsəlmanlara görsədirlər. Axırda, vallah, müsəlmanların da bikar cavanları yığışıb elə oynarlar ki, siz lap dəli olarsınız.

Hələ bunlardan savayı çox zadlar eliyirlər, ancaq gələn həftə yazaram.

**Kafir**

## HƏMŞƏRİ

**(Molla Nəsrəddinin lüğətindən)**

Həmşərinin mə'nası, yə'ni hamı bir yerdə şər iş tutmaq: yə'ni neçə adam bir yerə yığışıb bir pis iş görmək. Məsələn, necə ki Car bazarında həmşərilər yığışıblar ki, məscidi və məscid dükanlarını qazinin əlindən alsınlar.

## PİLLƏ-PİLLƏ

Pillə-pillədir.

Bir il bundan qabaq millətlər görürdülər ki, "bəli, əlbət, müsəlmanların ruhani rəisi belə olar".

Bəli, bir ay keçdi. Nə tövr oldu? - Bir biabırlıq üz verdi. Belə olanda genə qonşularımız uzaqdan baxa-baxa dedilər ki, "bəli, əlbət, elə şeyxülislam belə olar".

Bir ay da keçdi - genə müsəlmançılığa bir xəcalətlik üz verdi. Genə ətrafımızdakı tayfalar kənardan durub öz-özlərinə dedilər ki, "bəli, nə eybi var, müsəlmanların ruhani atası belə olar" (yə'ni atası belə olanda gör oğlanları necədir).

Bir-iki ay da keçdi - genə bir rüsvayçılıq üz verdi. Axır, vallah, bilmirəm nə deyim, adam doğrusu, utanır. Genə bu qonşular olmuya, genə məsələn, bu işlər Səlmasda, Buxarada, Zünuzda, Danabaş kəndində vaqe ola - adam deyər ki, "Aya, nə eliyək, cəhənnəmə-gora, bir özgə adam ki görmür".

Amma bu kafirlər içində vallah, yaşamalı deyil. Adam az qalır yerə girsin.

Bəli, genə bir-iki ay keçdi - genə həyamıza təzə bir sədəmə toxundu. Genə əğyar kənardan baxıb dedilər ki, "bəli, əlbət, elə şeyxülislam belə olar".

Xülasə.

Sözüm burasındadır ki, bunların hamısı pillə-pillədir.

**Dəli**

## SƏMƏRQƏNDDƏN MƏKTUB

**Qara qarğa**

Bu gün üç böyük məscidin səhnəsi hesab olunan Registanda Hacı Qul adında bir cavanın qarğası Nərzi Qul pəhlivanın qarğasından uca uçduğuna görə aralarında dava düşüb. Əvvəl hər iki tərəfin ağızlarından föhş atəşləri açılmağa başladı. Əsnayi-müharibədə mədrəsə tələbələrindən iştirak etmək istəyən olubsa da, 25 tamaşaçılar işə müdaxilə edib. Şükür olsun allaha, insan tələfatı olmuyub, ancaq Nərzi Qul pəhlivanın qarğasının boynun ip kəsib. Bu barədə hökumət hər nə istədi bu bid'əti camaat arasından götürsün, camaat razı olmadı, o səbəbə ki deyirlər "tərki-adət be movcibi-mərəz əst".

## NAXÇIVAN

Bu axır vaxtlarda çayçıxana, qumarxana, qiybətxana və tiryəkxanaların ədədi məktəblərin ədədindən artıq olmuşdu. Amma bu il Naxçıvan camaatı himmət edib məhərrəmlikdə verilən ehsan pullarını cəm edib məktəbləri artırdılar və yerdə qalan pulun çoxunu Buxaraya və Səmərqəndə məktəblər açmaq üçün bərat elədilər və qalan pullara da Sarvanlar məhəlləsində bir hacı...

(Mabə'di var)

## AŞQABAD XƏBƏRLƏRİ

Bu il məhərrəmdə Aşqabadda da çox-çox başlar qırxıldı. Əzon cümlə mərsiyəxan Molla Əbdüləli şirvanlıların başlarını min manata qədər qırxdı və qırxıb qurtarandan sora ülgücünü də götürüb birbaş təşrif apardı Məşhədə. Məşhədə nə üçün getmişdi, onu özü bilir. Amma Məşhəddən qayıdanda rus bajgirində biçarənin şeylərini bu kafir ruslar axtarıb bir dənə Kitay boşqabı və bir də bir kasa kandrabant tutublar. Aşqabadda həmin molla minbərdə deyir ki, qəzetə alanların və oxuyanların hamısı kafir və mürtəddir.

## E'LAN

Yaxşı mülküm, dövlətim, sarıkürklər arasında, seyid fabrikalarında və molla firmalarında hörmətim var. Yetim və bikəs qız uşaqlarına kömək etməyə və hər xərcini çəkib, müsəlman uşağına lazım olan tərbiyə verməyə hazıram. Səkkiz sinninə kimi əgər onlara ər tapılmasa özümə qəbuldurlar.

Adres: Aşqabadda öz evində.

## POÇTA QUTUSU

?Gəncədə "Bitərəf"ə: Bu barədə çox yazılıb.

?Şamaxıda "Yuxulu"ya: Məqalənizdən mə'lum olunmur ki, Molla Əbdülxalıq əfəndidən nə xəyanət baş verib. Çap edə bilmənik.

?Göyçayda "Q.D." cənablarına: Dünyavü aləm pirnən doludur.

?Aşqabadda "Geridə qalan"a: Rozəpəz Hacı Molla Əbdüləli gördüyü yuxunu yazmağı məsləhət bilmədik.

?Gəncədə "Bülbül"ə: Çox qəribə adamsan.

?Vladiqafqazda "H.C." cənablarına: Gərək and içəsən.

?Tiflisdə "Lotu"ya: Deyəsən, zarafat eliyirsən.

?Göyçayda "Abid"ə: Bəlkə bir vaxt işarə edək.

?Şuşada "Naqqal"a: Yapon dilini idarəmizdə oxuyan yoxdur.

Müdir və baş mühərrir
Cəlil Məmmədquluzadə.

Tiflisdə Mehmanxaneyi - "Dağıstan" Nömrələrinin qiyməti yarım manatdan üç manata qədərdir. Hər cür Asiya və Avropa xörəkləri gətirtmək olar. Təmiz və işıq nömrələrimiz çox rahatdırlar.
Pasportsuz qonaqlar zəhmət çəkməsinlər, çünki divan hökmünə görə qəbul olunmuyacaqlar.
Adres: Tiflis, Peskovski küçədə, nömrə 93, təzə müalicəxananın qabağında, konka duran meydanın yanında.
Sahibi mehmanxana: İsa Kərbəlayı Cəfər oğlu gəncəli.

Тифлисъ, Песковская ул., д.№ 93, противъ новой лечебницы д-ра Григорьяна, номера "ДАГЕСТАНЪ"

ÇAY QƏDRİ BİLƏNLƏR DİQQƏT ETSİNLƏR
ƏN Ə'LA ÇAY
Moskvada Vısotski və kampaniyasının çay şirkəti
**Т-ва чайной торговли В.Высоцкий и К°. Москва.**
Sərmayəsi 10.000000 manatdır. İldə 40.000000 manatlıq ticarət eliyir. Yaxşılığı səbəbindən bizim şirkətin çayı nəhayət dərəcədə çox işlənir və bizim şirkət kimi heç kəs o qədər mal satmır. Çayımız çox rəngli və ətirlidir və bir dəfə imtahan üçün çayımızı içən həmişəlik müştərimiz olur. Ticarət nişanəmiz də həmişəki kimi olmağına diqqət eləmək lazımdır. Zaqafqaziya, Zakaspiya və İran üçün şö'bəmiz Tiflisdə Puşkin küçəsində nömrə 7-dir. Telefon nömrə 432.
Тифлисъ, Пушкинская ул., №7. Телефонъ № 432.

Məhəmməd Hadi Əbdüssəlimzadənin 234 səhifədən mütəşəkkil "Firdövsi-ilhamat" nam məcmueyi-şe'riyyəsi mövqeyi-intişara qoyuldu. Qiyməti 1 manat 40 qəpikdir. Arzu edənlər aşağıdakı adresə müraciət buyursunlar: Bakı, bəradərani-Orucovların mətbəəsində Məhəmməd Hadi Əbdüssəlimzadəyə.
Баку, Типографія бр. Оруджевыхъ Мухаммедъ-Хади Абдуссалимъ-заде

**GRAND PRIX**
**ПАРИЖЪ, 1900 г.**

Dünyada

ə'la qaloşlar




Rus-Amerika rezin manufakturasının şirkəti

**ПОДЪ "ТРЕУГОЛЬНИКЪ" ФИРМОЙ**

Peterburqda

Malın yaxşılığına zəmanət edirik. Hər yerdə satılır.

## İDARƏMIZDƏ SATILAN KITABLAR

| Kitabların adları | Yazanlar | Qiymətləri: idarədən | Qiymətləri: poçta xərcilə |
|---|---|---|---|
| Dərs kitabları: Vətən dili, əvvəlinci il üçün dərs kitabı | Çernyayevski | 35 qəp. | 40 qəp. |
| Birinci kitab, əvvəlinci il üçün dərs kitabı | Gəncə müəllimi Mirzə Abbas Mollazadə | 20 qəp. | 24 qəp. |
| Uşaq bağçası, birinci il üçün dərs kitabı | Rəşidbəy Əfəndizadə | 25 qəp. | 30 qəp. |
| Bəsirətül-ətfal, birinci il üçün dərs kitabı | -*-*-*- | 25 qəp. | 30 qəp. |
| Məşq məcmuəsi | Mirzə Abbas Mollazadə | 8 qəp. | 10 qəp. |
| Qiraət kitabları: Təşrihül-fəraiz | Axund Araszadə | 1 man. | 1man. 16 qəp. |
| "Rüstəm və Söhrab" (gözəl şəkilli) | Abbas Ağa Qayıbov | 1 man. | 1man. 20 qəp. |
| Bizə hansı elmlər lazım | Axund Əbuturab mərhum, Ə.Hüseynzadə, Faiq Ne'manzadə və Molla Nəsrəddin | 15 qəp. | 20 qəp. |
| Usta Zeynal (şəkilli) | Molla Nəsrəddin | 15 qəp. | 17 qəp. |
| Qurbanəlibəy (-*-) | -*-*-*- | 15 qəp. | 17 qəp. |
| İranda hürriyyət (-*-) | -*-*-*- | 15 qəp. | 17 qəp. |
| Millət dostları | Haqverdiyev | 5 qəp. | 7 qəp. |
| Şeyx və vəzir və mübdəi-tərəqqi (farsca) | Mirzə Mülkümxan | 15 qəp. | 17 qəp. |
| tərəqqi (farsca) | -*-*-*- | 5 qəp. | 7 qəp. |
| Həqiqəti-islam | Axund Yusif Talıbzadə | 50 qəp. | 50 qəp. |
| İslam tarixi (birinci hissə) | -*-*-*- | 45 qəp. | 45 qəp. |
| İslam məmləkətlərinin xəritəsi | -*-*-*- | 25 qəp. | 25 qəp. |
| Müəllimüş-şəriə (birinci hissə) | -*-*-*- | 40 qəp. | 40 qəp. |
| Müəllimüş-şəriə (ikinci hissə) | -*-*-*- | 50 qəp. | 50 qəp. |
| İki uşaq | Mirzə Abdulla Talıbzadə | 20 qəp. | 20 qəp. |
| Qanlı müsadimə | -*-*-*- | 5 qəp. | 5 qəp. |
| Asari Əhmədbəy Cavanşir (milli şe'r məcmuəsi) | -*-*-*- | 25 qəp. | 30 qəp. |

***Şagird dəftərləri:** idarədə yüz dənəsi 2 manat 40 qəpik. Naləjnı vasitəsilə istəyənlər hər sifarişə 17 qəpik artıq poçta xərci verəcəklər.*


## ОСПЕННЫЙ ТЕЛЯТНИКЪ
### Живописцева въ г. ОРЛЕ



*50 adama çatan mayenin şüşəsi - 25 qəpik, 25 adama - 15 qəpik, 5 adama çatan maye - 5 qəpik bir manatdan əskiyə göndərilməz. Göndərmək xərci 30 qəpik. 3 manata və artıq istəyənlərə 20 prosentə qədər tənzil verilir. Adres: Oryol, Jivopistsevin çiçək mayaxanası.*

**Badkubədə Mehmanxaneyi - "İslamiyyə"**
**Гостиница "ИСЛАМИЯ"**
**въ гор. БАКУ.**

**Nömrələrinin qiyməti 1 manatdan beş manata qədərdir və aşpazxanamızda hər cür Asiya və Avropa xörəkləri mövcuddur. İstirahətini sevən müştərilərdən mehmanxanamızı bir dəfə gəlib görmələri rica olunur. Pasportsuz müsafirlər zəhmət çəkməsinlər, çünki divan hökmünə görə qəbul olunmuyacaqlar.**
**Adresimiz: Qubernski küçədə, Lalayevin evində Mehmanxaneyi-"İslamiyyə".**
**Sahibi-mehmanxana: İsmayıl Mahmudzadə.**

**Баку, Губернская ул. номера "ИСЛАМИЯ", телефон 1251.**

## ВНИМАНИЮ БОЛЬНЫХЪ!!!

Въ виду появившихся въ продаже вредныхъ для здоровья подделокъ Спермина предлагаемыхъ подъ различными названиями, необходимо при покупке обращать внимание на название

**Сперминъ Пеля**
проф. доктора
**Sperminum poehl**

и требовать таковой в подлинной упаковке Органотерапевтического Института профессора доктора Пеля и сыновей въ С.-Петербурге.

Все имеющиеся въ русской и иностранной литературе многочисленные научные наблюдения выдающихся ученых и врачей над благотворнымъ действиемъ спермина при неврастении, старческомъ маразме, неврастеническомъ половом безсилии, при переутомлении и тяжких заболеванияхъ, какъ малокровии, рахите, подагре, храническом ревматизме, сифилисе, чахотке, брюшном тифе, расстройстве сердечной деятельности (миокордите, ожирении сердца), истерии, спинной сухотке, параличахъ и проч. Относятся исключительно къ спермину профессора доктора Пеля. Сперминъ - Пеля имеется во всех аптекахъ и большихъ аптекарскихъ магазинахъ: 1) въ виде капель (Essentia Spermini - Poehl) 1 флаконъ - 3 руб., а также 2) въ ампулахъ для подкожных впрыскиванияхъ (Sperminum - Poehl pro inyectione) 1 коробка на 4 впрыск. - 3 руб. и 3) в виде клизмъ (Sperminum - Poehl pro clysm) 1 коробка на 4 клизмы - 3 руб.

При требов. литерат. высылающ. безвозмездно, просять указывать болезни для высыл. соответ. наблюд. врачей.
ОРГАНОТЕРАПЕВТИЧЕСКИЙ ИНСТИТУТЪ, ХИМИЧЕСКАЯ ЛАБОРАТОРИЯ И АПТЕКА ПРОФЕССОРА ДОКТОРА ПЕЛЯ И СЫНОВЕЙ ВЪ С.-ПЕТЕРБУРГЕ,
ВАС. ОСТР, 7 ЛИНИЯ, Д. №16-181

Наивысшие награды (Grands-Prix) на всехъ всемирныхъ выставкахъ и наилучшие отзывы медицинских авторитетов


## E'LAN

Tiflisdə xanımların, Qafqaz müsəlmanlarının və iranlıların cəmiyyəti-xeyriyyələrinin mənfəətinə həmin mart ayının 17-də tək günü Tiflisdə Artistiçeski teatrda cənab Ərəblinski və Tiflis cavanları tərəfindən Ə.Haqverdiyevin əsəri olan "Bəxtsiz bala" adlı faciəsi oynanacaq.

Müsəlmanlardan təvəqqə olunur ki, gəlib teatra tamaşa etməyi və cəmiyyəti-xeyriyyələrə az-çox mənfəət verməyi müzayiqə etməsinlər.

IV ГОДЪ ИЗДАНИЯ № 11 МАРТА 15-ГО 1909г.

# "Молла Насрединъ"

*КОНТОРА и РЕДАКЦІЯ*
журнала
"Молла Насреддинъ"
Тифлисъ:
*Давидовская ул.: д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКИЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

*ЦѢНА на ГОДЪ*
*Съ доставкою..............5 руб.*
*За границу...................6 руб.*
*ЦѢНА за ОБЪЯВЛЕНІЯ*
*За место занимаемое строкою*
*петита впереди текста .....10 коп.*
*позади * * * .....7 коп.*




Möhlət ilə verilir
Bir manatadək
Bir manatadək
Əl maşınları - 25 manatlıqdan başlamış
Rusiyada məhz öz mağazalarımızda satılır.
Tiflisdə üç məxsusi şö'bə var:
1. Qalovinski küçədə, Mirimanovun evində, Sərdar imarətinin qabağında.
2. Vağzal küçəsində, İnficiyansın evində.
3. Avlabarda, Kaxetinski küçədə, Həsən Calalovun evində.
Hökumət tərəfindən təsdiq olunmuş mağazin lövhəsi
Fabrika əlaməti
Saxtalarından ehtiyat edin.














Patentli "Pravodnik" qaloşları Çox möhkəmlikdə, yaxşılıqda və fasonunun zərifliyində dünyada birincidirlər.
Hər bir cütünün misilsiz möhkəmliyi, əlbəttə, tə'min olunur.



*Закавказскій Фабричный Складъ*
Т-во "ПРОВОДНИКЪ"
*Тифлисъ, Сололакская ул., 4.*




Təzə gələn konsul

Vallah, heç bilmirik nəyə ağlıyaq: təzəni istəyirik, köhnədən də razıyıq. Aman Allah, bizə rəhmin gəlsin. Biz padşaha yazarıq ki, ikisini də istəyirik.

Qulluqdan çıxıb gedən konsul




Müsəlmanın bal qonaqlığı
Milli libaslarımız
Keçə papaq, Parij jilitkası, Mərənd başmağı, rus sertuğu, Amerika qalstuku, İtaliya pidjakı, İran arxalığı, corab ətri, məşədi çepki, ingilis frakı, gümüş kəmər, nişastalı yaxa - hələ genə deyirlər ki, müsəlmanlar dala qalıblar.

# ملانصرالدین

№12 قیمتی ۱۲ قپك **МОЛЛА НАСРЕДДИНЪ** اوچونجی ایل ۱۲




Krımda Ruşdiyyə məktəbində

Direktor: Hər nə istəyirsiniz oxuda bilərsiniz. Məsələn, "Cameyi-Abbas", "Tarixi-müqəddəs", - amma fənn oxutmağa ixtiyarınız yoxdur.




İnşaallah, müsəlman gözlərini açıb




və yuxudan oyanıb.

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д.24.*

Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.

Тифлисъ, "Молла Насреддинъ"
Редакция журнала "Молла Насреддинъ"

**E'lan qiymәti**
Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik,
dal səhifədə 7 qəpik.
Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.

**13 rəbiül-əvvəl, 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 22 mart 1909**


# Акционерное Общество "ГРАММОФОНЪ"

*Тифлисское отделение*
*Головинский проспектъ, № 9.*






## QRAMOFON

Tiflis, Qalovinski küçədə, nömrə 9.

Burada göstərilən fabrika nişanəsinə lazımdır diqqət eləmək. Hər bir qramofonumuzun və qramofon hissələrinin üstündə bu nişanə var.

Danışan maşinaların heç bir fabrikasının ixtiyarı yoxdur öz maşinalarına qramofon adı qoysun, ondan ötrü ki, qramofon məhz bizim patentli maşinalarımızdan ibarətdir.

**Qramofon** ........ev üçün ən gözəl bir məşğuliyyətdir.

**Qramofon** ........oxuyur, çalır, gülür və qeyrə.

**Qramofon** ........vasitəsilə evdə sazanda və oynamaq məclisi qurmaq olur.

**Qramofon** ........dünyada əvvəlinci danışan maşinadır və həmişə əvvəlinci olacaq.

Bizim maşinaların tə'rifi: mexanizmi sadə, möhkəm, çox yaşayan, zahiri gözəl və hamıdan vacib - təbii səsləri öz halətində çıxardır.

Dekabrın birindən ikitərəfli plastinkalar başlanıb satılmağa: xırdaları 75 qəpik, "qrand" adlıları bir manat 50 qəpik hər biri.



Məsləhət görürük aşağıda ad verilən çalğıçı və sazandaların çalıb-oxumaqlarına heç olmasa imtahan üçün qulaq assınlar: Məcid, Seyid, Bağrat, Məhəmməd Xəlilov, Məhəmmədqulu şuşalı, Məşədi Qafar iranlı, Hilal. Xanımlardan: Varvara, Anna. Skripkaçılar: Arşak və Əmircan. Tarzən Ohanes (kamança), Sivi Mirzəqulu (kamança). Düdükçülər: Mirzəli Mirsadıqov. Zurnaçılar: Bağrat və Avetik və qeyrləri və qeyrləri.

Kataloqlar və siyahılar pulsuzdurlar!
Saxtalarından ehtiyatlı olunuz!



## KİŞİ

Molla dadaş, yaz bunu jurnalına,
Qurban olum bığına, saqqalına,
Məsləkinə, fikrinə, amalına,
İstəyir evlənsin o axmaq kişi.

İndiyədək mən buna allanmışam,
Arvad alanda necə tovlanmışam,
Gündə atam evinə yollanmışam,
İstəyir evlənsin o axmaq kişi.

Gündə dalaşmaq bizə adət olub,
Həftə barışmaq bizə adət olub,
Narə alışmaq bizə adət olub.
İstəyir evlənsin o axmaq kişi.

Bu kaftarın ölümü yaxınlaşıb,
Fəhmi gedib əql-kamalı çaşıb,
İndi də Zeynəb xalaya yannaşıb,
İstəyir evlənsin o axmaq kişi.

Molla dadaş, vallahı, çıldırmışam,
Qaraçı olmağımı bildirmişəm,
Lampanı, qab-qacağı sındırmışam,
İstəyir evlənsin o axmaq kişi.

Boğazından tutub yerə yıxmışam,
Kabab şişin sol qoluna soxmuşam,
İki əlli başın yerə çaxmışam,
İstəyir evlənsin o axmaq kişi.

Minib belinə altıma almışam,
Xışmalıyıb saqqalını yolmuşam,
Döyüb-döyüb it kökünə salmışam,
İstəyir evlənsin o axmaq kişi.

Getmişəm, ay Molla əmi, qırx ərə,
On birini dəfn elədim məqbərə,
Axırı aldı məni bu heyvərə,
İstəyir evlənsin o axmaq kişi.

Ərlərimin adını bilsən əgər,
İlk ərim oldu yaman dəngəsər,
Bir tat idi, adı çopur Mirsəfər,
İstəyir evlənsin o axmaq kişi.

İkincisi Nağı, üçüncü Rəhim,
Dördüncüsü Mehdi, beşinci Kərim,
Pirverdi, Haqverdi, Kəblayı Səlim,
İstəyir evlənsin o axmaq kişi.

Hacı Molla İsa, onuncu Musa,
On birinci çayçı Kablayı Rza,
Mollaqulu, tacir Hacı Mustafa,
İstəyir evlənsin o axmaq kişi.







Məşədi Miryusif, Hacı Şeyx
Həsən,
Dirlikçi Möhsünlə, Kablayı
Əmən,
Qoçəli, Eynulla və
kərpickəsən,
İstəyir evlənsin o axmaq kişi.

Mərsiyəxan naxçıvanlı bəradər,
Motal basan Fərəc, faytonçu
Əsgər,
Yol süpürən Mahmud, əkinçi
Qənbər,
İstəyir evlənsin o axmaq kişi.

Çayçı İbadulla, kömürçü Vəli,
Papaqçı Cabbar,
Kərim oğlu Əli,
Pirəli, Zülfəli, dəli Xanəli,
İstəyir evlənsin o axmaq kişi.

Baqqal yoğun Əkbər,
çayçı Mirxəlil,
Məsciddə Abasqulu,
Molla Cəlil,
Biri mərəndlidi, xoylu, Ərdəbil,
İstəyir evlənsin o axmaq kişi.

Bu saat axırıncısı heyvərə,
Məhəbbətim çoxdu bu kaftar
xərə,
Fikrimdə yox gedim bir
özgə ərə,
İstəyir evlənsin o axmaq kişi.

A Molla, mən qırxca
qapı gəzmişəm,
Can boğazıma yığılıb
bezmişəm,
Bir də görər ki,
başını əzmişəm,
İstəyir evlənsin o axmaq kişi.

Dabanıçatdaxdır adımdır
mənim,
Molla fırıldaq ustadımdır
mənim,
Boynuburuq da imdadımdır
mənim,
İstəyir evlənsin o axmaq kişi.

İslanmışın sudan nə baki
olsun,
Allah vara getsin yüz min
qız alsın,
Qonşumuzda Sijimqulu
sağ olsun,
Başarır evlənsin o axmaq kişi.

**Dabanıçatdaq xala**

## *TELEQRAF XƏBƏRLƏRİ*

**Şəki** - Cənab Nurməhəmməd əfəndinin bəlağətli nitqi ilə darülmüəlliminin açılmaq rəsmi başlandı. Şəkinin hamı üləması hazır bulub tə'sirli nitqləri ilə camaatı məktəbə təşviq etdilər.

**Molla Nəsrəddin**

Biz bu teleqrafa inana bilmirik, çünki aldığımız digər teleqrafa görə o gün bir neçə yerdə cənazə və yağlı plov var idi.

**Tokio** - Yaponiyalıların hər halları, hər təbiətləri müsəlmanlarınkına oxşuyur, bircə bundan savayı ki, arvadları üzüaçıq gəzir və məktəbləri, teatrları çoxdur və çalışqan, mə'rifətli və həmiyyətlidirlər və elm-mə'rifətcə avropalılara çatmışlar.

**Əbdürrəşid İbrahimov**

**Ağdam** - Buranın məktəbində, allah qoysa, apreldən dərslər başlanıb, qayda ilə oxunacaq.

**Bakı** - "Zənbur" bir-iki boynuyoğunu dişlədisə də, dəriləri çox yoğun olduğundan hələ bir tə'siri görülmədi.

**Orenburq** - "Din və məişət" məcmuəsi öz adının başındakı "d" hərfini "c" hərfinə təbdil etdi.

**Ordubad** - İranda evləri yandırılıb ac, çılpaq qaldıqlarından ötrü Rusiya səmtinə sığınan bir çox arvad və balalar Ordubad cəmiyyəti-xeyriyyəsindən razılıq edirlər.

**Petrovsk** - Molla Qəvam axundun və'zi sayəsində camaat bir-birilərilə elə mehriban olublar ki, deyəsən: su, od, barıt ilə qayrılmış səddi-İskəndərdir.

## ƏDƏBİYYAT

Səadəti kişinin baş verə
şəqavətdən,
Cəmaətin ölümü, nifrəti bu
halətdən?
Mənim sualıma hər kəs
verərsə eyni cavab,
Onun babasına rəhmət hamı
cəmaətdən.

Cahanda varmı müsəlman
içində bir dəllək
Ki çıxmıya başı dərman ilə
təbabətdən?
Keçəl başı elə ki qırxa bildi
ülgüc ilə,
Qutardı getdi cahanda dəxi
xəcalətdən.

Uşaqları edəcək xütnə, dişlərin
çəkəcək,
Qofal qanı alacaq yox hərasi
halətdən,
Cəmi' yaraların mərhəmi bişib
hazır,
Cibində həbbi-səlatini düşməz
adətdən.

Olur təbib o dəllak bir
cəmaətə kim,
Dadır o verdiyi hər şərbəti-
şəhadətdən,
Bir az zamanda salır bir yekə
məzarıstan,
Bununla da genə düşməz özü
sədaqətdən...

Ölüm xudanın işidir, əcəl
müəyyəndir,
Təbibi-baytal olur pak hər
qəbahətdən.
Təbiəti-şüəra incə olsa şişə
kimi,
Düşərdi səngi-nədamətlə
istiqamətdən.
Təbiətin genə cövlan edibdir,
ey sail,
Sual eyləmə keç get belə
şərarətdən.

**Sail**

## ƏRBAB

Bakı restoranlarından çıxan keyfli ərbabları görəndə mənə yəqin olur ki, cümə ehtiramın saxlamaq gəlib Bakının şə'ninə. Allah da razı, bəndə də. Xülasə, belə cümə ehtiramın saxlıyan qardaşlardan allah razı olsun, ona görə ki bilirəm, and içməsəm inanmıyacaqsınız. And olsun Bakıda bir müsəlmanın ermənıyə başın qırxdırmağına, sora başı papağın murdar eliyib, iki manat verib təzədən papaq tikdirməyinə. İnanmasan dəxi özün bil.

**Qırxayaq**

## TƏHVİL

Molla Nəsrəddin, sən nəsən? Mən gəlmişdim Aşqabada. Desən ki, haradan gəlmişdin - cəhaləti-xərabdan gəlmişdim. Soruşsan ki, niyə gəlmişdin, çox yaxşı eləmişdim, əlimin də içindən gəlmişdi, sənə nə, niyə gəlmişdim?

Bəli, gəldim Aşqabada. Əzqəza bayram və peyğəmbərsi və İmam Həsən vəfatı ki üçü də düşmüşdü bir yerə. Yığıldıq məscidlərə ki, həm təhəvvül eliyək, həm də tə'ziyə saxlıyaq. Mən də rast gəldim bir məscidə. Desən ki, orada nə var idi, bir damcı deyərəm ki, nə var idi: çoxlu uzun təsbehli, ağzı dualı, saqqalı hənalı, əlləri fındıqçalı mö'min kişilər var idi. Bir təşt doldurub zə'fəranlı su ilə araya qoyub, çoxluca da "həft səlam" duası yazıb teştin içinə töküb bir boşqab səbzi, bir gilabdan, bir boşqab yeddiləvin, bir kasada da bir neçə dənə balaca balıq, bir çay qaşığı da islanmış zə'fəran bu təştin ətrafına düzüb mö'min kişilər də bu təştin dövrəsinə düzülüb əllərində təsbeh gözlərin süzdürə-süzdürə "ya məqlübəl qülubül-mütəqəllibin" duası oxuyurlar. Ay molla, bir də gördüm ki, bu mö'min kişilər özlərini saldılar bu büsatın üstünə. Demə, bu zadlar təbərrikmişlər, təştin suyun istəkana, çaydana, qara aftabaya, butulkaya dolduran, saqqalına sürtən, içən... Qərəz, mən o qədər bacardım ki, başmaqlarımı götürüb qaçdım eşiyə.

Küçə ilə gedirdim, bir nəfər allah bəndəsi mənim qabağıma çıxıb soruşdu ki, hara gedirsən? Dedim: Dadaş, gedirəm vağzala, tamaşaya. Allah bəndəsi mənim qabağımı kəsib bir özgə küçə nişan verdi və dedi: Ay qardaş, mənim sənə yazığım gəlir, əgər istəyirsən ki, sağ və səlamət gedəsən - bu küçə ilə get, bu küçə ilə getmə. Dedim: Əzizim, səbəbi? Cavab verdi ki, bu küçədə "Fürudini məktəb"i var, əvvəla, qazi cənabı camaata xəbər verib ki, hər kəs "Fürudini məktəbi"nin həndəvərinə düşsə hökumət onun dədəsini yandıracaq və ikinci də budur ki, məşhur danosçu zərgər oğlu hökumətə danos verib ki, məktəbin sədri Xanlarbəy Ağayev və bundan savayı, genə iyirmiyə qədər şəhərin millət və mə'rifətpərəstləri həmişə uşkolda siyasi məclislər qurub xalqı yoldan çıxardırlar. İndi, ay qardaş, sən də yazıqsan, gedərsən, sən də əngələ düşərsən.

Mən, doğrusu, bir qərib adam, qorxub o biri küçə ilə başladım getməyə.

Vağzala yavuqlaşanda gördüm bir saldat durub, iki cavanə xaxol övrətləri ilə söhbət edir. Beş-altı nəfər bizim bayram tutan şüca' cavanlarımızdan bu tərəfdə divar dibində səf ilə düzülüblər, bu bayatıları növbə ilə oxuyurlar.

**1-ci cavan:**
"Əzizim, uf demərəm,
Yandırsan uf demərəm,
Bir gecə bizə gəlsən, ay namərd,
Ölsəm də uf demərəm, hi-hi-hi".

**2-ci:**
"Əzizim, ağlaram mən,
Sinəmi dağlaram mən,
Sənin o qulaş zülfünlə,
ay zalım balası,
Qollarım bağlaram mən".

**3-cü:**
"Əzizim, kabab oldum,
Qovruldum kabab oldum,
Nə qədər durum baxım,
a qannı fələk,
Baxmaqdan kabab oldum".

**4-cü:**
"Ağız, az aldat məni,
Yazığam, az aldat məni,
Ya götürrəm qaçaram,
ay allahım aman,
Ya vurar saldat məni, ə ə hi...

Mən də tez-tez bu bayatıları qoltuq dəftərimə yaza-yaza bir də gördüm bu bayatını da özüm yazmışam:

Əzizim, cəhlin evi yıxılsın,
Elmsizlik yox və puç olsun,
Cəhl qoymaz ki, adam
Mərsiyəxanların torundan
xilas olsun,
Ay bu cəhlin evi yıxılsın,
əəə əəəəəə hi.

**İmza: Müxbit**

## BAKIDAN

Gözünüz aydın!

Molla əmi, bu günlər Bakıya bir nəfər arvad həkimi gəlib, övladı olmuyan arvadlara müalicə edir və həm zamin durur ki, ona əcinnə, şeyatin toxunmasın. Özü də fala baxanda qara neftə baxıb dərdini deyir. Hər kəsin övladı olmasa rücu' etsin Bakıya. Və bu gün səfər ayının 27-i vəfati-peyğəmbərdir. Bakıda böyük izdihamnan Bibiheybətə müşərrəf olduq. Amma elə şuluq idi ki, bir nəfər paraxoddan suya düşdü, bir nəfərin qıçı barkaznan körpü arasında qalıb sındı. Hay şamaxılı, yaxşı əcr apardın! Arsızlar deyirlər ki, müsəlman dalda qalıb.

**İmza: Bitərəf**

## TƏZƏ İXTİRA

A kişi, biz müsəlmanlar kimi xoşbəxt insan olmaz. Allah-taala cəmi qabiliyyətləri yığıb, müsəlmanlara veribdir. Doğrudan, kişinin işini allah özü rast gətirməlidir. Bu zamana kimi heç biz darda qalmamışıq. Görürsən gündə birisi bir təzə şey ixtira elədi. İndi deyəcəksiniz ki, yalandır. Vallah, yalan demirəm. A kişi, Avropa alimləri bacarmadıqları işləri biz bacarırıq.

Birisi otuz-qırx yaşına kimi baqqallıq edə, birdən-birə həkim ola, buna nə deyərlər? Bu allah vergisi deyil də, bəs nədir? Sizə neçə belə həkim sayım? Bax, dəllək Məhəmməd, veyil Kazım, bənna Məşədi Abbasqulu, tun Mirzə Vahab... Bunlardan əvvəlincisi dəlləklik təcrübələrindən, ikinci atasının vəfatından sora, üçüncüsü rəhmətlik Cahanbanu xala ölən kimi, dördüncüsü birdən-birə həkim olmuşlar. Hə, indidəmi deyəcəksiniz ki, yalandır? Hələ bunlar dursun. Bizdə neçə-neçə fabrikalar açılıbdır. Bax, küfr fabrikası, lə'nət fabrikası, hiylə fabrikası, təzvir fabrikası. Hələ bunlara nə deyə bilərsiniz? Hər kəs inanmır, gəlsin məscidin günbatan tərəfinə bir yaxşı baxsın. Hələ bunlar heç. Cənnətin və cəhənnəmin də açarları bizdədir. Hər kəs inanmır, getsin boyaqçı Rzanın yanına, amma bir az... Hələ bunlar nədir? İndi bunlardan yekəsini söyləyəcəyəm. Uşağı olmuyan övrətlərə çarə göstərmişdik. Zülcinah fəqərəsi hamıya mə'lumdur. Qərəz, çox xoşbəxt insanıq. Bir az keçməz ki, cəmi dünya bizə möhtac olacaqdır. Gündən-günə təzə ixtiralar, təzə fabrikalar açılmaqdadır. Hamısından qəribəsi bu günlərdə bir mamaça tərəfindən olunan ixtiradır. Əsl məqsudim camaata bu xəbəri verməkdir. Belə ki mamaça Sofiya tərəfindən təzə dərman ixtira olunubdur ki, hər övrət onu yesə oğlu olar. Bu dərman indiyə kimi min dəfə Gəncədə təcrübə olunubdur. Əsərində şəkk və şübhə yoxdur. Biçarə mamaça dərman istəyənlərin əlindən təngə gəlibdir. Hərçənd qazancı çoxdur, genə də zəhmətdir, gündə bəlkə iyirmi-otuz evə gedib övrətlərə dərman verir. Bu ixtira çox yaxşı ixtiradır, amma bir qorxusu var. Qorxuram, bir on beş ildən sora Gəncədə qızların toxumu kəsilə və oğlanlara övrət tapılmıya.

**Əztərəfi dostunuz**
**Yoncasatan**

## LAMPA

Molla əmi! Vladiqafqaz məscidinə elektrik çıraqları çəkiləndən sora köhnə lampalar neçə ay bundan irəli lazım olmuyub satılıb; amma kim satıb, kimə satıb, nəqd satıb, nisyə satıb, neçəyə satıb və pulları hardadı, bunu allahdan savayı heç kəs bilmir. Hərçənd deyirlər ki, bizim mollanın bu işdən xəbəri var, amma iman gedən yerdi, dürüst bilməsəm yaza bilmərəm. Xülasə, təvəqqə olunur ki, hərgah bu barədə sizin idarəyə əhval olsa, bizə də xəbər verəsiniz. Çünki bu lampalar allah malıdır, labüd gərək pulları yerinə çatsın.

**Avam**

## BAKIDAN MƏKTUB

Cənab Molla əmi, bəndə sizin jurnalınızın 9-cu nömrəsində oxudum ki, neçə nəfər Məhəmmədəli ismində olanlar öz adların pozub qeyr bir ad qoymaq istəyirlər. Bəndə bu xüsusda sizdən təvəqqə eliyirəm, nə qədər olsa o adlardan naloj eliyib nəinki poştnan, əgər mümkün olsa teleqram ilə göndərəsiniz Bakıya, burada xiridari çoxdur. Qiymət yuxarı da olsa, eyib eləməz, ancaq təvəqqəm budur ki, tez göndərəsiniz.

**Millətpərəst**

## NAXÇIVANDAN

Molla əmi! Bir para adamlar bu xəyaldadırlar ki, guya şəhər Dumamız, yə'ni təzə qlasnılarımız heç bir iş görmürlər. Amma, Molla əmi, vallah, billah, Molla Mahmud Çakərin səfər ayında elədiyi gözəl moizələrə and olsun, onlar lap yalan deyirlər. Bizim şəhərimizin qlasnıları kimi iş görənlər mən sizi inandırıram heç Bakıda da yoxdu... Bax, məsələn, bu gün şəhər Dumasında bir mühüm məsələ aralığa qoydular. Belə, Molla əmi, vallah, çox böyük məsələ. Lailahə illəllah, lə'nət şeytana, adam utanır yazmağa. Məsələn, vağzalda bir fahişəxana açıblar, amma çox qiylü-qala səbəb oldu. O ki erməni qlasnıları idi, əbədən razı olmurdular, amma müsəlmanların papağı da razı idi. Xülasə, allah razı olsun. Erməni qlasnılarının ikisinə müqabil müsəlmanlar altı səs verdilər. Xülasə, bu il may ayında fahişəxana ya açılacaq ya açılmıyacaq. Hərgah açılsa hər surətdə müsəlmanların məsləhətidir, hərgah açılmasa çox pis olacaq.

**Dərd əhli**

## POÇTA QUTUSU

Nuxada "Turşu yeyən"ə: Bu dəfə çap olunmuyacaq. Bir də yazanda hər kəsi Nuxada bizə yavuq hesab edirsiniz - aparın kağızınıza qol çəksin.

Türkan kəndində "Mirzə Dəmşəlağ"a: Türkan kəndinə məcmuəmiz getmir. Bu səbəbdən kağızınız çap olunmuyacaq.

Bakıda "Daşkəsən"ə: Mərsiyəxanlardan yaxanızı qurtarsanız, qalan işlər hamısı asandır.

Dərbənddə "Ziyarətçi"yə: Yazdığınız mətləblərin əvvəlincisinin çap olunmağa ləyaqəti yoxdur, ikinci mətləb də çox yazılıb. Bir özgə şey yazınız.

Petrovskda "Nadan"a: Xəttiniz o qədər pisdir ki, kağızı heç oxumadıq.

Ağdamda "Rəfiq"ə: Təlxis olunmuş məqalə və onunla bərabər göndərdiyiniz məqalə yadıma gəlmir. Bəlkə idarəmizə çatmıyıb. Təzə məqalələriniz çap olunacaqlar.

Mərvdə "M.R." cənablarına: Gərək hələ çox qaynaya, çünki çiydir.

Müdir və baş mühərrir
Cəlil Məmmədquluzadə.

ÇAY QƏDRİ BİLƏNLƏR DİQQƏT ETSİNLƏR
ƏN Ə'LA ÇAY

Moskvada Vısotski və kampaniyasının çay şirkəti
**Т-ва чайной торговли В.Высоцкий и К°. Москва.**
Sərmayəsi 10.000000 manatdır. İldə 40.000000 manatlıq ticarət eliyir. Yaxşılığı səbəbindən bizim şirkətin çayı nəhayət dərəcədə çox işlənir və bizim şirkət kimi heç kəs o qədər mal satmır. Çayımız çox rəngli və ətirlidir və bir dəfə imtahan üçün çayımızı içən həmişəlik müştərimiz olur. Ticarət nişanəmiz də həmişəki kimi olmağına diqqət eləmək lazımdır. Zaqafqaziya, Zakaspiya və İran üçün şö'bəmiz Tiflisdə Puşkin küçəsində nömrə 7-dir. Telefon nömrə 432.
Тифлисъ, Пушкинская ул., №7. Телефонъ № 432.

Jurnalımızın təzə və köhnə nömrələri və kitabları Bakıda satılır Parapetdə - Varonsovski - Vrangelski küçələrin küncündə, Məşədi Əyyub Ələkbərovun dükanında. Xahiş edənlər oraya təşrif gətirsinlər.

İstanbulda məcmuəmizi satan Sultan Bəyaziddə, nömrə 14. "Həyat" kitabxanasında Kazımzadə cənablarıdır.

Tiflisdə Mehmanxaneyi - "Dağıstan"

Nömrələrinin qiyməti yarım manatdan üç manata qədərdir. Hər cür Asiya və Avropa xörəkləri gətirtmək olar. Təmiz və işıq nömrələrimiz çox rahatdırlar. Pasportsuz qonaqlar zəhmət çəkməsinlər, çünki divan hökmünə görə qəbul olunmuyacaqlar. Adres: Tiflis, Peskovski küçədə, nömrə 93, təzə müalicəxananın qabağında, konka duran meydanın yanında.
Sahibi mehmanxana: İsa Kərbəlayı Cəfər oğlu gəncəli.

Тифлисъ, Псковская ул., д.№ 93, против новой лечебницы д-ра Григорьяна, номера "ДАГЕСТАНЪ"





Peterburqda "Mexaniçeski" şirkətinin çox ə'la ayaqqabıları. Rantavoy tikilmiş və vintli, hər fasonda. Hər bir böyük mağazada satılır.



Əsl malların üstündə belə bir nişan var. Rus-Amerika rezin manufakturasının şirkəti Firması "Triuqolnik"

(Üçguşəli)

ТРЕУГОЛЬНИКЪ

Haman yerdə dəri skladı və bə'zi zaqraniçni mallar və Rus-Amerika rezin qaloşları manufakturasının Peterburqun "Mexaniçeski" şirkətinin ayaqqabılarından ötrü "krima" və "apritura".

Badkubədə Mehmanxaneyi - "İslamiyyə"
Гостиница "ИСЛАМИЯ"
въ гор. БАКУ.

Nömrələrinin qiyməti 1 manatdan beş manata qədərdir və aşpazxanamızda hər cür Asiya və Avropa xörəkləri mövcuddur. İstirahətini sevən müştərilərdən mehmanxanamızı bir dəfə gəlib görmələri rica olunur. Pasportsuz müsafirlər zəhmət çəkməsinlər, çünki divan hökmünə görə qəbul olunmuyacaqlar.
Adresimiz: Qubernski küçədə, Lalayevin evində Mehmanxaneyi-"İslamiyyə".
Sahibi-mehmanxana: İsmayıl Mahmudzadə.
Баку, Губернская ул. номера "ИСЛАМИЯ", телефон 1251.

**ОСЕННЫЙ ТЕЛЯТНИКЪ**
**Живописцева въ г. ОРЛЕ**

*50 adama çatan mayenin şüşəsi - 25 qəpik, 25 adama - 15 qəpik, 5 adama çatan maye - 5 qəpik bir manatdan əskiyə göndərilməz. Göndərmək xərci 30 qəpik. 3 manata və artıq istəyənlərə 20 prosentə qədər tənzil verilir. Adres: Oryol, Jivopistsevin çiçək mayaxanası.*



ВНИМАНИЮ БОЛЬНЫХЪ!!!

Въ виду появившихся въ продаже вредныхъ для здоровья подделокъ Спермина предлагаемыхъ подъ различными названиями, необходимо при покупке обращать внимание на название

**Сперминъ Пеля**
проф. доктора
**Sperminum poehl**

и требовать таковой в подлинной упаковке Органотерапевтического Института профессора доктора Пеля и сыновей въ С.-Петербурге.

Все имеющиеся въ русской и иностранной литературе многочисленные научные наблюдения выдающихся ученых и врачей над благотворнымъ действиемъ спермина при неврастении, старческомъ маразме, неврастеническомъ половом безсилии, при переутомлении и тяжких заболеванияхъ, какъ малокровии, рахите, подагре, храническом ревматизме, сифлисе, чахотке, брюшном тифе, расстройстве сердечной деятельности (миокордите, ожирении сердца), истерии, спинной сухотке, параличахъ и проч. Относятся исключительно къ спермину профессора доктора Пеля. Сперминъ - Пеля имеется во всех аптекахъ и большихъ аптекарскихъ магазинахъ: 1) въ виде капель (Essentia Spermini - Poehl) 1 флаконъ - 3 руб., а также 2) въ ампулахъ для подкожных впрыскиванияхъ (Sperminum - Poehl pro inyectione) 1 коробка на 4 впрыск. - 3 руб. и 3) в виде клизмъ (Sperminum - Poehl pro clysm) 1 коробка на 4 клизмы - 3 руб.

При требов. литерат. высылающ. безвозмездно, просять указывать болезни для высыл. соответ. наблюд. врачей.

ОРГАНОТЕРАПЕВТИЧЕСКИЙ ИНСТИТУТЪ, ХИМИЧЕСКАЯ ЛАБОРАТОРИЯ И АПТЕКА ПРОФЕССОРА ДОКТОРА ПЕЛЯ И СЫНОВЕЙ ВЪ С.-ПЕТЕРБУРГЕ,
ВАС. ОСТР, 7 ЛИНИЯ, Д. №16-181

Наивысшие награды (Grands-Prix) на всехъ всемирныхъ выставкахъ и наилучшие отзывы медицинских авторитетов

E'LAN

Bir nəfər gimnaziya qurtaran gürcü qızı müsəlman evində qız və oğlan uşaqlarına tərbiyə və dərs vermək istəyir. Altıncı klasadək dərs verə bilər. Özgə şəhərə də getməyi qəbul eliyir. Xahiş edənlər "Molla Nəsrəddin" idarəsindən soruşsunlar.

E'LAN

Hər cür Asiya və Avropa libaslarını tikməyi qəbul edirik və ucuz qiymət alıb səliqəli iş görmək ilə həmişə müştəriləri razı yola salırıq. Sifariş sahibləri aşağıdakı adresə rücu' etsinlər: Tiflis, Qanovski küçədə, nömrə 4.
İsmayıl Hacı Məhəmməd oğlu Hacıyev.
Тифлисъ, Гановская ул., №4.

TƏZƏ AÇILAN MÜALİCƏXANA
**"Тифлисская частная лечебница"**
Вокзальная 8, д.Энфиаджианца
Телефонъ 695

İ.Q.Fyodorov - İçəri və uşaq azarının həkimi. Qəbul edir hər gün çaharşənbə və bazardan savayı saat 11-dən 12-dək.

V.D.Qambaşidze - İçəri və uşaq azarı. Hər gün bazardan savayı saat 12-dən 1-dək.

B.A.Popov - Boğaz, burun və qulaq həkimi. Hər gün bazardan savayı saat 12-dən 1-dək.

Q.M.Makarov - İçəri və uşaq azarlarının həkimi. Tək və cümə günləri 1-dən 2-dək.

A.N.Diasamidze - Siflis, dəri və süzənək. Hər gün 11 yarımdan 12 yarımadək.

N.M.Melikov - Cərrahlıq və övrət azarları. Hər gün 1-dən 2-dək.

İ.Q.Qomarteli - İçəri və uşaq azarı. Hər gün 2-dən 3-dək.

V.S.Musxilov - Göz azarı. Hər gün bazardan savayı 2-dən 2 yarımadək.

**Axşamlar**

A.Q.Mirzoyev - İçəri və uşaq azarı. Hər gün bazardan savayı 5-dən 6-dək.

N.Q.Çiçinadze - İçəri və uşaq azarı. Hər gün bazardan savayı 6-dan 7-dək.

Müalicəxanada hər bir azar elm yolu ilə təhqiq olunur, habelə çiçək döyülür və əmzikli övrətlərə də baxılır. Məsləhətə gələnlərdən 50 qəpik alınır.

**"ZƏNBUR"**
**Bakıda təzə çıxmağa başlıyan "Zənbur" adında məsxərə məcmuəsinə abunə dəftəri açıqdır. Abunə qiyməti - ildə 5 manat, yarım ildə - 3 manat. Əcnəbi məmləkətlərə illiyi - 6 manatdır. Adres: Bakı, "Zənbur" idarəsinə.**

IV ГОДЪ ИЗДАНИЯ № 12 МАРТА 22-ГО 1909г.

# "Молла Насрединъ"

КОНТОРА и РЕДАКЦИЯ
журнала
"Молла Насреддинъ"
Тифлисъ,
Давидовская ул., д.24

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКИЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

ЦѢНА на ГОДЪ
Съ доставкою..............5 руб.
За границу....................6 руб.
ЦѢНА за ОБЪЯВЛЕНИЯ
За место занимаемое строкою
петита впереди текста .....10 коп.
позади " " " .....7 коп.




Möhlət ilə verilir
Bir manatadək
Bir manatadək
Əl maşınları - 25 manatlıqdan başlamış
Rusiyada məhz öz mağazalarımızda satılır.
Tiflisdə üç məxsusi şö'bə var:
1. Qalovinski küçədə, Mirimanovun evində, Sərdar imarətinin qabağında.
2. Vağzal küçəsində, İnficiyansın evində.
3. Avlabarda, Kaxetinski küçədə, Həsən Calalovun evində.
Hökumət tərəfindən təsdiq olunmuş mağaza lövhəsi




Fabrika əlaməti
Saxtalarından ehtiyat edin.



# Т-во ПРОВОДНИКЪ
## ВЪ РИГЕ
"Pravodnik" şirkəti Riqa şəhərində

1897




1888

Karxanalar:

**Rezin qaloşlar**
**Keçə rezindən ayaqqabılar**
**Araba və velosiped şinləri və hissələri**
**Rezindən maşın alətləri**
**Elektrik maşını alətləri**
**Ebonit və buynuzdan qayrılmış şeylər**
**Fonoqrafiya alətləri**
**Rezin oyuncaqları (iqruşka) və qalantereyni şeylər**
**Cərrah və həkim hacətləri**
**Elektrik qüvvəsini kənar edən və sudan keçirən alətlər**

**Rezinlənmiş parçalar və sukeçirməyən paltarlar**
**Azbest və talkdan qayrılmış mallar**
**Linoleum, birrəngli, güllü və probka ilə aralanmış**
**Rezindən, pinkadan və qeyr qollar**
**Rezina buludları**
**Rezin daraqları**
**Hava ilə dolu və qeyr cür avtomobil şinləri**
**Linkrustlar**
**Saxta dərilər (gönlər)**

*Zaqafqaziyada fabrika anbarı*
*Tiflis, Salolak küçəsində, nömrə 4.*
*Тифлисъ, Сололакская ул., № 4.*




İbrahim ağa Vəkilov

Когда не былъ Председателемъ мус. благотворительнаго Общества.

Cəmiyyəti - xeyriyyə sədr olmamışdan irəli




Sədr olandan sonra

Посль избрания вь предсьдатели

Yaşasın Osmanlı azadlığı...

Yaşasın məşrutə

Да здравствуетъ турецкая конституція.

Митингъ женщинъ
въ Константинопол...

ترکیا ده خانم لار یغینجاغی .

О, ужасъ! Намъ не надо такой конституціи...

Bay, bay! Bu imiş məşrutə? Yox, yox, bizə lazım deyil.

# ملا نصرالدين

№ 13 Цѣна 12 к. МОЛЛА НАСРЕДДИНЪ قیمتی ۱۲ قپیک ۳۱ ۱۳





Литог. С. Быхова

Cəlali Hacı Əfəndi: siz məni molla eləmədiniz, - mən
də şikayət elədim ki, mənim məscidimdə müsəlmanlar məndən izinsiz namaz qılırlar.



Qafqazda molla cənazəsinin təzə üsul ilə
götürülməsi
Похороны умершаго муллы въ двадцатомъ векъ
(не до Рождества Христова, а посль)

ABUNƏ QİYMƏTİ

Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

İdarə və kantor
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д.24.*

Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.

Тифлисъ, "Молла Насреддинъ"
Редакция журнала "Молла Насреддинъ"

E'lan qiyməti
Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik,
dal səhifədə 7 qəpik.
Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.

20 rəbiül-əvvəl, 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 29 mart 1909


# Акционерное Общество "ГРАММОФОНЪ"

*Тифлисское отделение*
*Головинский проспектъ, № 9.*




QRAMOFON



Tiflis, Qalovinski küçədə, nömrə 9.

Burada göstərilən fabrika nişanəsinə lazımdır diqqət eləmək. Hər bir qramofonumuzun və qramofon hissələrinin üstündə bu nişanə var.

Danışan maşinaların heç bir fabrikasının ixtiyarı yoxdur öz maşinalarına qramofon adı qoysun, ondan ötrü ki, qramofon məhz bizim patentli maşinalarımızdan ibarətdir.

**Qramofon** ........ev üçün ən gözəl bir məşğuliyyətdir.

**Qramofon** ........oxuyur, çalır, gülür və qeyrə.

**Qramofon** ........vasitəsilə evdə sazanda və oynamaq məclisi qurmaq olur.

**Qramofon** ........dünyada əvvəlinci danışan maşinadır və həmişə əvvəlinci olacaq.

Bizim maşinaların tə'rifi: mexanizmi sadə, möhkəm, çox yaşayan, zahiri gözəl və hamıdan vacib - təbii səsləri öz halətində çıxardır.

Dekabrın birindən ikitərəfli plastinkalar başlanıb satılmağa: xırdaları 75 qəpik, "qrand" adlıları bir manat 50 qəpik hər biri.



Məsləhət görürük aşağıda ad verilən çalğıçı və sazandaların çalıb-oxumaqlarına heç olmasa imtahan üçün qulaq assınlar: Məcid, Seyid, Bağrat, Məhəmməd Xəlilov, Məhəmmədqulu şuşalı, Məşədi Qafar iranlı, Hilal. Xanımlardan: Varvara, Anna. Skripkaçılar: Arşak və Əmircan. Tarzən Ohanes (kamança), Sivi Mirzəqulu (kamança). Düdükçülər: Mirzəli Mirsadıqov. Zurnaçılar: Bağrat və Avetik və qeyrləri və qeyrləri.

Kataloqlar və siyahılar pulsuzdurlar!
Saxtalarından ehtiyatlı olunuz!



## XANIMLAR

Serbiya məmləkətində səkkiz min xanım hökumətdən izin istəyiblər ki, Avstriya hökuməti ilə Serbiya hökuməti dava başlasa, xanımlar çıxsınlar meydana və kişilər ilə bərabər düşmən ilə dava eləsinlər.

Buna heç sözüm yoxdur, çünki hər bir kəsin ixtiyarı özündədir, insan faili-muxtardır, hər kəs nə xahiş eləsə, eliyə bilər, hər kəs nə danışsa, nə yazsa, yaza bilər, danışa bilər; amma sözüm burasındadır ki, bu xəbəri eşitcək mənim yadıma bir şey düşdü.

Bir neçə həftə bundan irəli axundlarımızdan birisi xəbər vermişdi ki, cəmi xristiyan xanımları bihəyadırlar, çünki üzüaçıq gəzirlər.

Axund cənablarının sözünü oxuyanda, doğrusu, mən bir az istədim bu sözlərə inanmıyam; ondan ötrü ki, ömrümdə nə qədər xristiyan xanımları görmüşəm, nə qədər bunların barəsində az-çox kitablar oxumuşam, nə qədər Avropa tarixinə az-çox bələd olmuşam, mənim heç bir vaxt xəyalıma gəlmiyib ki, xristiyan xanımlarının hamısı bihəya olalar.

Axund cənablarının sözünə bir də o səbəbə şəkk gətirdim ki, strajnik arvadlarından savayı axund cənabları dəxi özgə xristiyan arvadı görmüyüb və hələ görmədiyi qalsın kənarda, heç bilmir ki, xristiyan arvadları dünyanın hansı tərəfində yaşıyırlar. Mən mərc gələrəm ki, indi gedək axund cənablarından təvəqqə eliyək ki, xristiyan arvadlarının hansı səmtdə olmaqlarını əli ilə göstərsin. Söz yox - axund əlini bir tərəfə uzadacaq, - amma əgər gərək biz yaxşı mülahizə eləsək, baxıb görəcəyik ki, o göstərdiyi tərəf ya Danabaş kəndidir, yainki Yaponiya ilə Sibirin arasıdır.

Sözüm orada deyil, sözüm oradadır ki, doğrudan, bu da bir hünərdir ki, adam bir şeyi bilmiyə-bilmiyə və eşitmiyə-eşitmiyə o şeydən xəbər verə; bu özü də bir cür elmdir, hələ nəinki elmdir, bəlkə allah vergisidir.

Çox qəribə.

Bu axır vaxtlarda xristiyan xanımlarını bizim qəzetələrdə "fahişə" adı ilə adlandıran çox olub. Amma biz diqqət eləsək, görəcəyik ki, belə sözü danışanlar və yazanlar həmişə o kəslər olublar ki, Avropa tarixindən, Avropa məişətindən və Avropa mədəniyyətindən əsla bixəbərdirlər.

Bu özü də allah vergisidir.
Bu özü də bir hünərdir.

Çünki insan öz bildiyi şeylərdən həmişə danışa bilər, amma hünər budur ki, elə mətləbdən danışasan ki, heç onu yuxunda da görməmisən.

Bu özü çox böyük hünərdir.
Hələ bəlkə allah vergisidir.

**Lağlağı**







## LALSAN

Sən hələ dillənməmisən,
lalsan.
Tiflisən a, sən hələ novsalsan.

Bilmə hələ sən özünü kardan,
Olma özündən a çocuq,
bədgüman,
Ortalığa çıxma, əzizim, dayan,
Çünki, balam, sən hələ
novsalsan,
Dəyməmisən, yetməmisən,
kalsan.

Soxma qabağa özünü anqalı,
Gözləgilən növbəni
daldan-dalı,
Ay beli palanlı, başı noxtalı,
Sən keçisən, sən quzusan,
malsan,
Sən hələ dillənməmisən,
lalsan.

Ermeniyə kəndini tay eyləmə,
Gürcüyə, nə rusə gilay
eyləmə,
Üstümə qışqırma,
haray eyləmə,
Dəstəni qaytar, yeri
daldal sən,
Qıl hələ təhsil ilə ikmal sən.

**Məşədi Sijimqulu**

## TELEQRAF XƏBƏRLƏRİ

**İstanbul** - Hürriyyətdir, meydan genişdir. Həmd olsun, hər məhəllədə bir təzə cəmiyyət meydana çıxır. Deyirlər ki, bu günlərdə buranın köhnə itləri də öz haqlarını mühafizə etmək üçün dəhşətli bir cəmiyyət quracaqlar.

**Molla Nəsrəddin**

"İttihadi-Məhmudi cəmiyyəti"-nə və "Bəyanül-həqq"ə müjdələr olsun.

**Peterburq** - Hökumət müsəlmanların məktəblərini bağlatmağa başlamasından ötrü Kazan, Orenburq, Tomsk, Troisk, Samara, Ufa və qeyrə müsəlman quberniyalarındakı baş ruhanilər, işanlar "Duma"ya şikayət göndərdilər.

**Bakı** - Cənab Şəmsi Əsədullayev öz adına böyük bir kitabxana açmaq niyyətindədir.

Cənab Dadaşov da beş klaslı bir qız məktəbi açacaq.

**Şamaxı** - Cənab Salamov, Abdullayev, Hacı Molla Qəni, Veysov və qeyrə dövlətli sünni və şiələr birləşib bir sənət məktəbi açmaq istəyirlər.

**Tiflis** - Cəmiyyəti-xeyriyyələrin mənfəətinə oynanan teatrdan altı min manat cəm oldu. Yarım manatlıq bilet alıb xəlvətcə əvvəlinci cərgəyə keçən məşədilər səhnəyə gül dəstələri tulladılar.

## VƏ'Z

**(Naxçıvanda Mirəbdülhüseyn ağanın bəyanatı)**

"Fəvaidül-müşahid" kitabında Şeyx Cəfər Şüştəri mərhum yazır: "İnnaəlmünafiqin fi dərkül-əsfəl", münafiq müştəqdir nəfqədən, nəfqə o şeydir ki, ürəyi ayrı ola, dili ayrı ola (bə'zi yazıçılar kimi). Bu münafiq əlli üqbə görəcək, hər üqbənin arası əlli illik yoldur. O illərin hər bir günü bu dünyanın otuz min ilinə bərabərdir. O əlli üqbənin biri aləmi-bərzəxdir, biri haləti-ehtirazdır, biri qiyamətdir, biri suali-qəbirdir, biri tabutdur, biri qızdırmadır (biri qəzetə oxumaqdır), biri mizandır, biri nəşrdir (qalanı ağanın nəzərindən fəramuş olmuşdu). Bu üqbələri tey eliyəndən sora münafiq daxil olacaq cəhənnəmə, orada neçə min il qalacaq (yə'ni Suxum şəhərində müsəlmanların məscidi tikilib qurtarana kimi qalacaq), amma bu münafiqlərdən eləsi olacaq ki, cəhənnəmdə neçə min il qalandan sora birdən yadına düşəcək, "ya mənan ya mənan" deyib haman saat bağışlanacaq. Amma eləsi də olacaq ki, "ya allah" demək ona qadağan olacaq.

**İmza: Münafiqlərindən biri**

## İSLAM ALƏMİNDƏ NƏ YOX?

**"Din və məişət" yazır (nömrə 10):**

İnqilabiyyunlar arvadlara müsavati-hüquq verdirib, hicabı rədd qılsalar, ol vaxt işlər nərəyə gedəcək? Arvadlara tam hürriyyət və müsavat verilsə, o vaxtda kişilər arvadlara "sus, çox danışma" deməyə qeyrətləri çatmayacaq və ağılı, dini naqis olan arvadlar ağıllı mütədəyyin kişilərə qarşı durub: "bu işdə bizim ağlımız boylə kəsir" deyəcəklər və kişilərin hər əmrinə qulaq asmıyacaqlar...

**Molla Nəsrəddin**

Afərin, qoçaq! Sözün doğrusunu yazmaq da bir hünərdir. İndi bildik ki, arvadların oxumalarını, "naqisül-əql valideyn"likdən qurtulmalarını, üzlərini açmalarını nədən ötrü istəmirsiniz.

Dəxi buna bir sözümüz yoxdur, madam ki arvadlara "sus", yə'ni "kəs səsini, köpəyin qızı" deyə bilməməkdən qorxursunuz, "hicab"a dörd ayaq ilə sarılmağa haqqınız vardır.

## TƏHVİL SUYU

Şuşa mollalarını o qədər məzəmmət etdilər ki, axırda təngə gəlib onlar da millət yolunda çalışmağa başladılar. Belə ki, iyirmi il dərs oxumuş cənablar ilimiz təzələnən günü çox tez durmuşdular ki, millətin tərəqqisindən ötrü təhvil suyu hazır etsinlər. Onlardan hər biri bir təşti su ilə doldurub qabağına qoyub hey dua oxuyub onun içinə üfürürdü və su aparmağa gələn yazıqlar da belə güman edirdilər ki, o molla duanı və ayələri oxuyub suyun içinə doldurur. Dəxi burasını başa düşmürlərdi ki, duanı oxuyub suya üfürməklə duanı suyun içinə doldurmaq olmaz. Çünki dua oxumaq mövqufat puluna oxşayan deyil ki, onu cəmləyib birdən cibişdana qoymaq olsun. Bəlkə oxunan duanın hər hərfi ağızdan çıxan kimi havaya qarışıb gedir. Əgər bir adam onun ağzından çıxıb təşti dolduran haman havaya zərrəbin ilə baxsa, görər ki, onun içi cəhl və nifaq kimi naxoşluqların mikrobları ilə doludur. Bizim ruhani atalarımız bu cür mikroblar ilə dolu olan təştin içindəki suyun adını "təhvil suyu" qoyurlar. "Vələzzalin" kəlməsini lap məxrəcdən gətirən əmilərə də deyirlər ki, bu suda çox xasiyyətlər vardır. Biri budur ki, hər kim ondan bir azca xəmir küpəsinə töksə bərəkətli olar və pul kisəsinə səpsə kisəsi heç boşalmaz və qırmızısaqqal əmilər də bircə burasını fikir etmirlər ki, əgər bu suda belə xasiyyət varsa, bəs nə cəhətə o suyu paylayan mollanın xəmir küpəsinin heç bərəkəti olmur və pul kisəsi həmişə boş olur. Gah allahın evini dükan qayırır və gah da qəssabı, baqqalı. Xülasə, hamı bazar əhlini tovluyub evlərini yıxır. Bundan vazeh olur ki, o suda heç bərəkət yoxdur və suyun xasiyyətlərindən biri də budur ki, məktəblərdə və mədrəsələrdə oxuyan islam balaları ondan bir azca içsə zehinləri çoxalar və oxumadıqları elmləri və fənləri də o suyun bərəkətindən bilərlər. Pəs uşkolada oxuyan uşaqlar da hər birisi istəsə ki, bu il imtahanı yaxşı versin və ya heç bir zad oxumamış hamı elmlərə və fənlərə dara olsun, gərək o təhvil suyundan bir az içsin. Necə ki onu paylıyan mollalarımızın özləri heç bir kitab oxumamış o suyun bərəkətindən məcmu elmləri bilirlər.

**Kəşkül**

## ZƏKİYYƏ

Martın onunda Gəncədə teatrda Ərəş uyezd naçalnikinin dilmancı teatrın bufetində o qədər içmişdi ki, az qalmışdı piyan olsun. Bir-iki dəfə oturduğu stoldan yıxıldısa da, genə özü durub yerində otura bildi. Çinovnik Abulbəy, Əlibəy və Vəlibəy, filan bəy adi bircə damcı da içməmişdilər; ancaq başları gedib-gəlir və sallanır idi. Oyunun ikinci pərdəsi oynandığı halda dilmanc cənabları yoldaşı ilə qol-boyun olub sazandara təsnif zakaz verir idilər. Zəkiyyə rolunu oynuyan qızdan ötrü tamam iyirmi adam özündən getmişdi. Teatra nə qədər xərc olunmuş idisə, müsəlmanlar iki o qədər bufet kassasına pul verdilər.

## İSTİXARƏ

İranda təhsil edib gələn sadati-üzamdan bir nəfər axund Nuxa şəhərində həkimlik edir. Allah atasına rəhmət eləsin, çünki başqa həkimlər naxoşa dərmanı tutar-tutmaz verirlər. Amma bu rəhmətlik oğlu əvvəl istixarə edir, sonra dərman verir. İstixarədə bir fəzilət vardır ki, o verdiyi dərman naxoşu bivaxt öldürsə təqsir həkimdə deyil, istixarədədir.

## CÜMƏ

"Ey dil, həzar şükr xəbər gəldi yardən,
Olduq xilas dərdü qəmü ah-zardən".

Günlərin bir günündə Dərbəndə xəbər gəldi ki, Tiflisdə, Bakıda, Qarabağda, Şəkidə, İranda müsəlmanlar cümə günü dükanlarını bağlıyıb dadüstəd etməyib bayram edillər. Bu xəbər Dərbənd dükançılarına dəxi tə'sir edib forən cümə günü bağlıyıb dadüstəd etmədilər. Sən demə, cümə dünyada çox imiş: hey bir cümə, iki cümə, üç cümə, dörd cümə bəqərar bir neçə cümə bağladılar. Xeyr! Gördülər ki, bu zalım cümənin nə ucu var, nə bucağı. Axır təngə gəlib yavaş-yavaş başladılar genə qərari-sabiq üzrə açıb dadüstəd etməyə. "Ey göz, kənara qoy dəxi qan ağlamaqlığı - Oldun xilas sən də dəxi intizardən". Qərəz ki, şükür olsun allaha, xilas oldular intizardən. Canım, bir cümə deyil, iki cümə deyil, cümə çox, il çox, buna da davam etmək olurmu? Xalqın dərdi bir yana, bunlarınkı bir yana. Xülasə, çox şükürlər olsun ki, xalqın yaxası qurtardı bu cümə zəhrimarın əlindən. İndi bu gündən Dərbənd müsəlmanına hürriyyət verildi. Sağ olsun Taxtabazar, yaşasın Aşağıbazar, yaşasın Yuxarıbazar.

**İmza: Bığlı**

## İLİN AXIR ÇƏRŞƏNBƏSİ

Mart ayının üçüncü axşamı ilin axır çərşənbəsinin axşamı idi. Bir neçə qoca qarı, qız və gəlin Məşədi Yaxşı xalanın təhtisədarətində bir evə yığılıb "Dilək tası" qurdular. Ortalığa bir mis qazan qoyub içinə su tökdülər, ağzına bir qırmızı cuna salıb hərə ürəyində bir niyyət eliyib qazanın içinə bir şey saldı. Əvvəl başdan Mırtış Nərgiz bu bayatını oxudu:

Ey əzizim, naçar ağlama,
Gündür, kecər ağlama,
Hacı Vəli bağlıyan qapını,
Məhəmmədəli açar, ağlama.

Əlini cunanın altından qazanın içinə salıb bir göy muncuq çıxartdı. Dingiliş xanım sevincək yerindən qalxıb dedi: "Ay Mırtış Nərgiz gəlinbacı, o muncuq mənimdir".

**Sədr** Məşədi Yaxşı xala - De görüm, nə niyyət eləmişdin?

Dingiliş xanım - Hacı Vəli varyoxumuzu hiylə ilə əlimizdən alıb yurdumuzu dağıtdı, niyyət eləmişdim görüm axırımız hayana çıxır?

**Sədr** - Axırın yaxşı olur,
"A əzizim, naçar ağlama, -
Gündür keçər, ağlama",
Hacı Vəli bağlıyan qapını ərin
Məhəmmədəli açar, ağlama.

Dingiliş xanım sevinmiş çəkildi durdu bir qıraqda.

Növbət gəldi Fartdax xalaya, bu bayatını deyib əlini saldı qazanın içinə:

Enişdən gəl, enişdən,
Aftabası gümüşdən,
Bizə də qismət olsun,
Heybəndəki yemişdən.

Bir qızıl üzük çıxartdı. Bu üzüyü salan da Balağıbatdax bacı idi, dedi o üzük mənimdir.

**Sədr** - Sən nə niyyət eləmişdin?

Balağıbatdax bacı - Mən də niyyət eləmişdim on ildir uşağım olmur, əgər olacaqsa yaxşı gəlsin.

**Sədr** - Yaxşıdır, uşağın olcaqdır, arxayın ol. Bizə də qismət olsun heybəndəki yemişdən.

Növbət gəldi Bibixanım xalaya.

Enişdən gələnə bax,
Qaz kimi dönənə bax,
Muradı hasil olub,
Çırağı yanana bax.

Əlini salıb Sədəf çıxartdı. Xatun bacı sevincək dedi, o sədəf mənimdir.

**Sədr** - Sən nə niyyət eliyibsən?

Xatun bacı - Mənim ərim səfeh çıxıbdır. Evimi, həyətimi satıb qumara uduzubdur, evimin şeylərini və qızıl-gümüşümü də aparıb satıb yeyibdir. Özü də məndən nifrət eliyib gedib bir rus qızı saxlıyır. Dedim əgər bu pis gündən qurtaracağamsa yaxşı gəlsin.

**Sədr** - Yaxşıdır, muradın hasil olub, çırağın yanacaqdır.

Növbət gəldi Bacıxanım xalaya:

Sarı yağın tortası,
Qızıl kəmər ortası,
Allah muradın versin,
Gələn bazar ertəsi.

Əlini salıb bir qulunc üzüyü çıxartdı.

Məşədi Molla Xeyransa xanım - O üzük mənimdir.

**Sədr** - Niyyətin nədir?

Məşədi Molla Xeyransa xanım - Niyyət eləmişdim ki, bu gələn bazar və bazar ertəsi həm bayramdır, həm ərbəin. Əgər camaat mərsiyə oxudub bayrama baxmıyacaqlarsa və əlimə beş-on tümən pul gələcəksə yaxşı gəlsin.

**Sədr** - Yaxşıdır, mərsiyəni oxuyub istədiyin qədər pul yığacaqsan.

Məşədi Xeyransa xanım - Mən də nəzir eliyirəm ki, mərsiyəxan Molla Əbdüləbvabə siğə olub haman pul ilə Xorasana gedəm.

(Mabə'di var).

**Dabanıçatdaq xala**

## POÇTA QUTUSU

Culfada "O taylı" imzası ilə yazana: Elə şeyləri indiki vaxtda yaza bilmənik.

Bakıda "Hərami"yə: Mabə'dini yazmıyın, çünki qorxuram sizə zəhmət ola.

Qazaxda "Miskin"ə:
Getdim gördüm Qazaxdadı,
Daşda deyil, çaxmaqdadı,
Hamı yazısı "saxta"dı,
Ay bala can, can bala can.

Mərvdə "H.M." cənablarına: Çap olunmuyacaq.

Mərvdə "Dindar"a: Səhv eliyibsiniz, gərək yazdığınızı "Din və məişət" jurnalına göndərəydiniz.

Şuşada "F" cənablarına: Fahişəxana barəsində yazdığınıza inanırıq, amma o sözləri çap edə bilmənik.

Bakıda "Rəhbər"ə: Ədəbsiz sözləri yazmağı tərgidin, yoxsa sizə sataşarıq.

Gəncədə "Bir cavan"a: Qoyma getdi.

Müdir və baş mühərrir
Cəlil Məmmədquluzadə.

Tiflisdə Mehmanxaneyi - "Dağıstan"
Nömrələrinin qiyməti yarım manatdan üç manata qədərdir. Hər cür Asiya və Avropa xörəkləri gətirtmək olar. Təmiz və işıq nömrələrimiz çox rahatdırlar. Pasportsuz qonaqlar zəhmət çəkməsinlər, çünki divan hökmünə görə qəbul olunmuyacaqlar. Adres: Tiflis, Peskovski küçədə, nömrə 93, təzə müalicəxananın qabağında, konka duran meydanın yanında.
Sahibi mehmanxana: İsa Kərbəlayı Cəfər oğlu gəncəli.

Тифлисъ, Песковская ул., д. № 93, противъ новой лечебницы д-ра Григорьяна, номера "ДАГЕСТАНЪ"

ОСЕННЫЙ ТЕЛЯТНИКЪ
Живописцева въ г. ОРЛЕ

*50 adama çatan mayenin şüşəsi - 25 qəpik, 25 adama - 15 qəpik, 5 adama çatan maye - 5 qəpik bir manatdan əskiyə göndərilməz. Göndərmək xərci 30 qəpik. 3 manata və artıq istəyənlərə 20 prosentə qədər tənzil verilir. Adres: Oryol, Jivopistsevin çiçək mayaxanası.*



**İstanbulda məcmuəmizi satan Sultan Bəyaziddə, nömrə 14. "Həyat" kitabxanasında Kazımzadə cənablarıdır.**

**Badkubədə Mehmanxaneyi - "İslamiyyə"**
**Гостиница "ИСЛАМИЯ"**
**въ гор. БАКУ.**
**Nömrələrinin qiyməti 1 manatdan beş manata qədərdir və aspazxanamızda hər cür Asiya və Avropa xörəkləri mövcuddur. İstirahətini sevən müştərilərdən mehmanxanamızı bir dəfə gəlib görmələri rica olunur. Pasportsuz müsafirlər zəhmət çəkməsinlər, çünki divan hökmünə görə qəbul olunmuyacaqlar.**
**Adresimiz: Qubernski küçədə, Lalayevin evində Mehmanxaneyi-"İslamiyyə".**
**Sahibi-mehmanxana: İsmayıl Mahmud-zadə.**
**Баку, Губернская ул. номера "ИСЛАМИЯ", телефон 1251.**

**GRAND PRIX**
**ПАРИЖЪ, 1900 г.**

Dünyada

ə'la qaloşlar




Rus-Amerika rezin manufakturasının şirkəti

**ПОДЪ "ТРЕУГОЛЬНИКЪ" ФИРМОЙ**

Peterburqda

Malın yaxşılığına zəmanət edirik. Hər yerdə satılır.

## İDARƏMİZDƏ SATILAN KITABLAR

| Kitabların adları | Yazanlar | Qiymətləri | |
|---|---|---|---|
| | | idarədən | poçta xərcilə |
| Dərs kitabları: Vətən dili, əvvəlinci il üçün dərs kitabı | Çernyayevski | 35 qəp. | 40 qəp. |
| Türk əlifbası | Müəllim M.Mahmudbəyov | 20 qəp. | 24 qəp. |
| Birinci kitab, əvvəlinci il üçün dəsr kitabı | Gəncə müəllimi Mirzə Abbas Mollazadə | 20 qəp. | 24 qəp. |
| Uşaq bağçası, birinci il üçün dəsr kitabı | Rəşidbəy Əfəndizadə | 25 qəp. | 30 qəp. |
| Bəsirətül-ətfal, ikinci il üçün dəsr kitabı | -*--*--*- | 25 qəp. | 30 qəp. |
| Məşq məcmuəsi | Mirzə Abbas Mollazadə | 8 qəp. | 10 qəp. |
| Qiraət kitabları: Təşrihül-fəraiz | Axund Araszadə | 1 man. | 1man. 16 qəp. |
| "Rüstəm və Söhrab" (gözəl şəkilli) | Abbas Ağa Qayıbov | 1 man. | 1man. 20 qəp. |
| Bizə hansı elmlər lazım | Axund Əbuturab mərhum, Ə.Hüseynzadə, Faiq Ne'manzadə və Molla Nəsrəddin | 15 qəp. | 20 qəp. |
| Usta Zeynal (şəkilli) | Molla Nəsrəddin | 15 qəp. | 17 qəp. |
| Qurbanəlibəy (-*-) | -*--*--*- | 15 qəp. | 17 qəp. |
| İranda hürriyyət (-*-) | -*--*--*- | 15 qəp. | 17 qəp. |
| Millət dostları | Haqverdiyev | 5 qəp. | 7 qəp. |
| Şeyx və vəzir (farsca) | Mirzə Mülkümxan | 20 qəp. | 24 qəp. |
| Məbdəi-tərəqqi (farsca) | -*--*--*- | 5 qəp. | 7 qəp. |
| Həqiqəti-islam | Axund Yusif Talıb-zadə | 50 qəp. | 50 qəp. |
| İslam tarixi (birinci hissə) | -*--*--*- | 45 qəp. | 45 qəp. |
| İslam məmləkətlərinin xəritəsi | -*--*--*- | 25 qəp. | 25 qəp. |
| Müəllimüş-şəriə (birinci hissə) | -*--*--*- | 40 qəp. | 40 qəp. |
| Müəllimüş-şəriə (ikinci hissə) | -*--*--*- | 50 qəp. | 50 qəp. |
| İki uşaq | Mirzə Abdulla Talıb-zadə | 20 qəp. | 20 qəp. |
| Qanlı müsadimə | -*--*--*- | 5 qəp. | 5 qəp. |
| Asari Əhmədbəy Cavanşir (milli şe'r məcmuəsi) | -*--*--*- | 25 qəp. | 30 qəp. |

***Şagird dəftərləri:** idarədə yüz dənəsi 2 manat 40 qəpik. Naləjnı vasitəsilə istəyənlər hər sifarişə 17 qəpik artıq poçta xərci verəcəklər.*

TƏZƏ AÇILAN MÜALİCƏXANA

**"Тифлисская частная лечебница"**

Вокзальная 8, д.Энфиаджианца

Телефонъ 695

İ.Q.Fyodorov - İçəri və uşaq azarının həkimi. Qəbul edir hər gün çaharşənbə və bazardan savayı saat 11-dən 12-dək.

V.D.Qambaşidze - İçəri və uşaq azarı. Hər gün bazardan savayı saat 12-dən 1-dək.

B.A.Popov - Boğaz, burun və qulaq həkimi. Hər gün bazardan savayı saat 12-dən 1-dək.

Q.M.Makarov - İçəri və uşaq azarlarının həkimi. Tək və cümə günləri 1-dən 2-dək.

A.N.Disamidze - Siflis, dəri və süzənək. Hər gün 11 yarımdan 12 yarımadək.

N.M.Melikov - Cərrahlıq və övrət azarları. Hər gün 1-dən 2-dək.

İ.Q.Qomarteli - İçəri və uşaq azarı. Hər gün 2-dən 3-dək.

V.S.Musxilov - Göz azarı. Hər gün bazardan savayı 2-dən 2 yarımadək.

**Axşamlar**

A.Q.Mirzoyev - İçəri və uşaq azarı. Hər gün bazardan savayı 5-dən 6-dək.

N.Q.Çiçinadze - İçəri və uşaq azarı. Hər gün bazardan savayı 6-dan 7-dək.

Müalicəxanada hər bir azar elm yolu ilə təhqiq olunur, habelə çiçək döyülür və əmzikli övrətlərə də baxılır. Məsləhətə gələnlərdən 50 qəpik alınır.

# E'LAN

1. "Hesab məsələsi" (Задачникъ). Bu kitab məktəblərdə və evlərdə hesab tə'limi üçün tərtib olunub 761 hesab məsələsini, 237 tə'limati-rəqəmiyyəyi və Rusiyada iste'mal olunan ölçüləri və ölçülərə dair tə'limləri havidir. Qiyməti 35 qəpikdir.

2. Gündəlik dərsləri yazmaq üçün yövmiyyə dəftəri (Дневникъ). Şagirdlərə gündəlik, həftəlik, aylıq və illik nömrələr qoymaq və dərsləri yazmaq üçün cədvəlləri və bə'zi digər mə'lumatı havidir. Qiyməti 30 qəpik.

Bu kitabları almaq istəyən müəllimlərə və kitabçılara böyük təfavüt qoyulacaqdır. On ədəddən əskiyinə poçta markaları qəbul olunur. Xahiş edənlərə naloj ilə göndərilir.

Adres: Gəncədə Həmidbəy Yusifbəyova, yaxud Məktəbi-ruhani kitabxanasına.

# "Молла Насрединъ"

КОНТОРА и РЕДАКЦIЯ
журнала
"Молла Насреддинъ"
Тифлисъ:
Давидовская ул.: д.24

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКIЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

ЦѢНА на ГОДЪ
Съ доставкою..............5 руб.
За границу....................6 руб.
ЦѢНА за ОБЪЯВЛЕНIЯ
За место занимаемое строкою
петита впереди текста .....10 коп.
позади * * * .....7 коп.






Möhlət ilə verilir
Bir manatadək
Bir manatadək
Əl maşınları - 25 manatlıqdan başlamış
Rusiyada məhz öz mağazalarımızda satılır.
Tiflisdə üç məxsusi şö'bə var:
1. Qalovinski küçədə, Mirimanovun evində, Sərdar imarətinin qabağında.
2. Vağzal küçəsində, İnficiyansın evində.
3. Avlabarda, Kaxetinski küçədə, Həsən Calalovun evində.
Hökumət tərəfindən təsdiq olunmuş mağaza lövhəsi
Fabrika əlaməti
Saxtalarından ehtiyat edin.














Patentli "Pravodnik" qaloşları Çox möhkəmlikdə, yaxşılıqda və fasonunun zərifliyində dünyada birincidirlər.
Hər bir cütünün misilsiz möhkəmliyi, əlbəttə, tə'min olunur.



Закавказскiй Фабричный Складъ
Т-во "ПРОВОДНИКЪ"
Тифлисъ, Сололакская ул., 4.




Молодая конституція и турецкая пресса.




*Продажа билетовъ на спектакль въ пользу благотв. Общества (Тифлисъ)*

Tiflisdə Şeytanbazarda cəmiyyəti-xeyriyyə üzvləri
müsəlmanlara, teatr bileti satırlar

ملا نصرالدین

№14. Цѣна 12 к. МОЛЛА НАСРЕДДИНЪ قیمتی ۱۲ قپک




Əbdülrəşid: Xanım, nə qədər tərəqqi eləsəniz - bu
üzü açıq gəzməklə genə müsəlmanlara çata bilməyəcəksiniz. (Molla və Yaponiya xanımı)



A kişi, Molla Nəsrəddin zəhləmizi apardı, bir dənə "Zənbur" gətirin oxuyaq.



Ey, apar, apar, bu da onun kimi bir bəd əməldir.

**ABUNƏ QİYMƏTİ**
Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davidov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д. 24.*

**Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.**

Тифлисъ, "Молла Насреддинъ"
Редакция журнала "Молла Насреддинъ"

E'lan qiyməti

Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.
Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.

**27 rəbiül-əvvəl 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 5 aprel 1909**

**"Molla Nəsrəddin"in əvvəlinci, ikinci və üçüncü ilinin cildlənmiş kitabları və boş cildləri satılmaqdadır. Cildlərin üstündə Mollanın şəkli və adı, məcmuənin tarixi qızıl vərəq ilə basılıbdır. Qiymətləri idarədə: əvvəlinci ili 5 manat, ikinci və üçüncü ili 6 manat, boş cildi 70 qəpik, poçta xərci ilə: əvvəlinci ili 6 manat, ikinci və üçüncü ili 7 manat, boş cildi 1 manat.**






# Т-ВО ПРОВОДНИКЪ
## ВЪ РИГЕ

1888

"Pravodnik" şirkəti Riqa şəhərində

1897

Karxanalar:

**Rezin qaloşlar**
**Keçə rezindən ayaqqabılar**
**Araba və velosiped şinləri və hissələri**
**Rezindən maşın alətləri**
**Elektrik maşını alətləri**
**Ebonit və buynuzdan qayrılmış şeylər**
**Fotoqrafiya alətləri**
**Rezin oyuncaqları (iqruşka) və qalantereyni şeylər**
**Cərrah və həkim hacətləri**
**Elektrik qüvvəsini kənar edən və sudan keçirən alətlər**

**Rezinlənmiş parçalar və sukeçirməyən paltarlar**
**Azbest və talkdan qayrılmış mallar**
**Linoleum, birrəngli, güllü və probka ilə aralanmış**
**Rezindən, pinkadan və qeyr qollar**
**Rezina buludları**
**Rezin daraqları**
**Hava ilə dolu və qeyr cür avtomobil şinləri**
**Linkrustlar**
**Saxta dərilər (gönlər)**

*Zaqafqaziyada fabrika anbarı*
*Tiflis, Salolak küçəsində, nömrə 4.*
*Тифлисъ, Сололакская ул., № 4.*



## *12-ci nömrədə Dabanıçatdaq xalaya*

**CAVAB**

Ağrın alım, Dabanıçatdaq xala,
Sən niyə düşdün belə qiylə, qala?
İstəyir axmaq ərin övrət ala?
Eyləmə ona təşviş, baxdır fala,
Caduya saldır adı, dillənməsin,
Ta ki sənin üstünə evlənməsin.

Çox qocalıbsan, baxıram halına,
Dən də düşüb birçəginə, yalına,
Qırx kişini qatlamısan dalına,
Çünki çıxıb şohəri-bəd falına,
İndi zəbanbənd elə, dillənməsin,
Ta ki sənin üstünə evlənməsin.

Beş şahı ver, bir dua yazdır nala,
Sonra alıxla kişini noxtala,
Tut yaxasından itələ, çalxala,
Gah da qabağında gəzib yorğala,
Ta ki sənin üstünə evlənməsin,
Olmasın azürdə, nə dillənməsin.

Dannama bihudə o biçarəni,
Tazələmə sinədəki yarəni,
Qonşuda görsün Sənəmi, Sarəni,
Saxlasın ifritəni, məkkarəni?
Eyləsin əmsak, meyillənməsin?
Axiri-ömründə bəhəllənməsin?

Yalın ağarmış, yox ağızda dişin,
Sür-sifətin pis, daha pisdir işin,
Ev-eşiyin, qab-qacağın, bişmişin,
Get-gəl, otur-dur, hərəkət, gərdişin,
Yekcəsi bikarədi, bəs neyləsin?!
Bir-iki övrət alıb evlənməsin?

Ay qoca Fartdax! Sənə mən yüz kərə,
Söyləmədimmi eləmə məsxərə?
Bəsdir, ay arvad, hayasız heyvərə,
Eyləmə bir bunca şəqavət ərə,
Ər, bəqonum-qonşuda əylənməsin?
Siğeyi-müt'ə edib evlənməsin?

At ilə övrətdə tapılmaz vəfa,
Yaxşı məsəldir, deyib ata-baba,
Yekcə əliəyri, uzundil yava,
Bit-birəli, sirkəli, həm bihəya,
Bəs bu başıdaşlı kişi dinməsin?
Eyləməsin siğə, həm evlənməsin?

Ay yatağan, əqli gödək, cahilə,
Biqanacaq, tənbələ və kahilə,
Lağ eliyirsən bu qədər ahilə,
Fe'linə də fəxr eliyirsən hələ,
Çək dilini, bir belə zillənməsin,
Ağzını pak eylə, zibillənməsin.

**Məşədi Sijimqulu**







## *QOQOL*

Bu axır vaxtlarda cəmi müsəlman qəzetələrində müsəlman qardaşların gözünə bir belə söz sataşıb: "Qoqol".

İndi müsəlman qardaşlar oxuyub bildilər ki, Qoqol bir məşhur

rus yazıçısının adıdır. Bildilər ki, bu yazıçı yüz il bundan irəli anadan olub. Bildilər ki, məzhəkənəvislikdə bu şəxsə bərabər Rusiyada hələ bir kəs tapılmıyıb. Bildilər ki, Qoqolun xidməti rus mətbuatına və rus millətinə o dərəcədə olub ki, mərhumun doğulmasının yüz illiyini Rusiyada kəndlərdə də mujiklər eşidiblər.

İndi də mənim fikrimə bir belə şey gəlir. Söz yox, Köçərli cənablarının açıq və mə'nalı məqalələrindən, Üzeyir cənablarının şirin tərcümələrindən və qeyr yazıçılarımızın Qoqol barəsində verdikləri mə'lumatdan oxucularımız həmin yazıçını bir növ tanıdılar və bəlkə yaxşı tanıdılar.

Amma mən bunu istəyirəm deyəm ki, genə bununla belə, yə'ni bu yazı-pozuların varlığı ilə rus dilini bilmiyən oxucularımız indi hələ genə bilmirlər ki, bu yazıçının adı nədir.

Məsələn, yazıçılarımız yazıblar "Qoqol" və elə xəyal eliyiblər ki, bu sözü cəmi müsəlmanlar o cür oxuyacaq, necə ki mərhumun elə əsli adıdır.

Deməк, məqalə sahiblərimiz bircə şeyi yaddan çıxardıblar. Bircə bunu yaddan çıxardıblar ki, Qoqolun barəsində yazdıqları məqalənin başında gərək bir belə "xəbərdarlıq" eliyəydilər ki, ey müsəlman qardaşlar, yüz il bundan qabaq Rusiyada bir şəxs anadan olub və rus mə'murlarının barəsində bir elə komediya yazıb ki, onu indi də adam oxuyanda elə bilir ki, Naxçıvana, Şuşaya və bütün Qafqaz kəndlərinə və balaca şəhərlərə hökumət tərəfindən revizor gəlir.

Qərəz, sözüm burada deyil.

Mən deyirəm ki, məqalə sahibləri bu sözlərdən qabaq gərək camaata deyəydilər ki, "ay müsəlman qardaşlar, bu ədibin barəsində mən sizə çox söz yaza bilərəm, amma..."

Amma bircə şey məni aciz eliyir: Mən bilmirəm mərhumun adını necə yazım ki, siz oxuya biləsiniz?

Mən yazıram "Qoqol". Bəlkə allah rast sala, bir adam bu sözü elə oxuya, necə ki şairin adıdır. Amma bilirəm ki, biriniz bir cür oxuyacaqsınız, biriniz özgə sayaq oxuyacaqsınız, biriniz bir başqa tövr oxuyacaqsınız və axırda belə mə'lum olacaq ki, biçarə yazıçının adını siz müsəlman qardaşlar yüz qırx dörd cür oxuyubsunuz.

Elə bircə bunu demək istəyirdim, demək istəyirdim ki, qələm sahiblərimiz hər nə yazırlar-yazsınlar, - çox sağ olsunlar, amma bunu gərək yaddan çıxartmasınlar ki, hələ indi müsəlmanlar genə Qoqolun adını bilmirlər.

Bunu heç kəs gərək yadından çıxartmasın.

**Molla Nəsrəddin**

---

## *ƏDƏBİYYAT*

Əcəb halın var, ay Molla-
Əcəbcə ruzigarın var!
Əcəb əsrü zamanın həm-
Əcəb şüğlü şüarın var!

Əcəb məslək, əcəb fikrin,
Əcəb virdin, əcəb zikrin,
Əcəb surət, əcəb şəklin
Əcəb dövrün, mədarın var!

Əcəb sima və saqqalın,
Əcəb rəngi-ruxi-alın,
Əcəb xirqə, əcəb şalın
Və təmkinü vüqarın var!

Əcəb vəz'in, əcəb pəndin,
Əcəb noğlun, əcəb qəndin,
Əcəb hiylən, əcəb fəndin,
Əcəbcə kirdarın var!

Əcəb aləmnümayanın,
Əcəb cahil müridanın,
Əcəb vəhşi və heyvanın,
Otuz milyon himarın var!

Biyabanı əcəb qulun,
Cününun, qeyri-mə'qulun,
Əcəb məğmum məs'ulun,
Nihanın, aşikarın var!

Gözündə seyli-qəm yaşın,
Vətən amalı yoldaşın,
Qarışmış zəhr ilə aşın,
Əcəb leylü nəharın var!

Əcəb niyyət, əcəb amal,
Əcəb tə'mini-istiqbal,
Əcəb təğyiri-vəz'i-hal,
Əcəbdir, ixtiyarın var!

Əcəb, ay Molla Nəsrəddin,
Bu xəlqi eylədin bidin,
Təəccübdür ki, yox həqbin,
Görə bir hansı karın var.

Danışma gavi-mahidən,
Uzaqsan sən ilahidən!
Danış meydan, sürahidən,
O yolda iştəharın var!

Demə bu yer müdəvvərdir,
Günəş yerdən də əkbərdir,
Bu əncümdür, bu kokəbdir,
Nə nurun var, nə narın var!

Edirsənmi hələ diqqət,
Nə cöhərlər doğur millət?
Edir təkfir, oxur lə'nət,
Nə qədri kor, karın var!

A nainsaf lə'nətxan,
Belə getməz belə dövran,
Yalan söylə, danış böhtan,
Nə qədri iqtidarın var!

Uzaq getməz, verərsən can,
Olarsan vasili-niran,
Səni orda tapar xortdan,
Səqərdə mur, marın var!

Zəmanə dəyşilər bir gün,
Gözün millət silər bir gün
Vurar başın əzər bir gün,
Nə izzü e'tibarın var!

A Molla, bəd gəlib falın,
Dəyişdir fikrü amalın,
Nə tək sən, cümlə əmsalın,
Və illa, intiharın var!

.....................

Sataşdın xasilə amə,
Toxundun qeyrətə, namə,
Hazırlan qətlə, e'damə,
Əcəb gorun, məzarın var!

.....................

Yığ övraqın, qələmdanın,
Həlakətdən qutar canın,
Demə var ibn Ne'manın,
Demə çox cannisarın var.

**Məşədi Sijimqulu**

## HÜMMƏT

Bilmirəm harada oxumuşdum ki, "Hümmətül-cihal titrədil-cibal", yə'ni əgər bir millət himmət eləsə dağları titrədə bilər.

Doğrudan, bu sözlər elə belə imiş ki, deyiblər.

Mən bunu dünən mart ayının 17-də öz gözümnən gördüm. Sabunçuda dəmir yolun qırağında çox camaat yığışmışdı. Xəbər aldım ki, nə var? Dedilər ki, bir qoç Mərdəkandan gətiriblər, bir qoç da Balaxanıdan gətiriblər. Bir az keçmədi, allahın heyvanlarını dürtmələyə-dürtmələyə saldılar meydana (hələ bir para axmaqlar da təəccüb eliyirlər ki, müsəlman içində qəzetə oxunmur). Xülasə, dəxi nə başınızı ağrıdım, buynuz şaqqıltısından Bibiheybət dağları elə şaqqıldıyırdı ki, deyəsən urus divanxanasına başmaqlı müsəlman girib.

**Dəmirçi**

## QƏVAM

**("Molla Nəsrəddin"in lüğətindən)**

Bə'zi xörəklər var bişəndə qəvamə gəlir, yə'ni bir az bərkiyir. Məsələn, üzüm suyu nə qədər ki bişmiyib, suyuq olur, amma elə ki bir qədər qaynıyır - başlıyır bərkiməyə. Elə ki bərkidi, qəvamə gəldi - olur doşab (bəhməz). Bu cür xörəklər çoxdur, məsələn, firni, nişasta, halva, qayqanağ, süt aşı və qeyrə.

"Qəvam" sözünün çox işlənən yeri Petrovsk şəhəridir, çünki axır vaxtlarda bir nəfər axund iranlı və qafqazlı davası bişirmək fikrinə düşüb və bu məsələni salıb qazana qaynatmaq istəyir və gözləyir ki, məsələ tezlikdə bişib hazır olsun, yə'ni qəvamə gəlsin. Onunçün bu axundun da adı qalıb "qəvam".

Xülasə, qəsdimiz "qəvam" kəlməsini mə'na eləməkdir, yoxsa Axund Molla Qəvam ilə işimiz yoxdur.

"Qəvam" sözünün özgə mə'naları da var, amma hamıdan çox Petrovsk şəhərində işlənən mə'nada iste'mal olunur.

**Cırcırama**

## İSTANBULDAN MƏKTUB

Ay Molla, burası uzaq olduğundanmı, nədənsə bizdən çox az bəhs edirsən. Halbuki sənin qırmızısaqqallı dostların burada azsa da, sarıbeyinli aşnaların çoxdur. Xüsusən, hürriyyət aləmidir. Sənin gözün orada Ordubadı, İrəvanı görür, Şamaxıya, Ağdaşa sataşır. Bir buraya, islam mərkəzinə gəl gör ki, gündə nə dəccallar, mehdilər zühur edir; nə "vulkanlar", "bəyanülhəqlər", "hüquqi-ümumiyyələr" çıxır.

Bir gəl gör ki, "təninlər", "yeni qəzetələr", "iqdamlar", "şurayiümmətlər", "sərbəstilər", "qaragözlər"... nasıl bir-birlərinin ağızlarından öpüşürlər, nə növ vətən və millət dərdinə qalıb öz şəxslərini yaddan çıxarmışlar.

Şükür allaha, hər məhəllədə, hər qəhvəxanada bir firqə təşkil olunur. Yetmiş iki bıçıq taifə dedikləri tamam buradadır: çərkəs, gürcü, arnaud, boşnak, laz, zibək, kürd, ərəb, suriyalı, ləzgi, tatar, türkmən, yezidi, çənganə... və qeyrə klublarının sayı yox! On türk, on zabit tamam on dürlü fikirdə. Burada, həmd olsun, firqə və məsləkdən artıq taifəbazlıq iş görür.

Hələ bizim məşrutəçiləri heç bilməzsiniz. Siz hey İran məşrutəçilərinə lə'nət oxursunuz. Amma bizim elmli, mədəniyyətli şəhərimizin məşrutəçilərini görsəniz, onlara rəhmət oxursunuz.

Bizim "Bəyanül-həqq"i, "Vulkan"ı oxusanız, özünüzün "Din və məişət"inə tükürməzsiz; Əbdürrəşid İbrahimovun yazılarına "çeynənmiş axmaq sözlər" deməzsiniz. Quba qazisinin hicab barəsində yazdıqlarına "avam gözünü boyamaq" adını verməzsiniz. Molla Nəsrəddinin şairinin bir vaxt dediyi sözləri biz indi şiddətli rədd eliyirik:

Amalımız, əfkarımız
ifnayi-vətəndir,
Kinü mərəzü hirs bizə
zinəti-təndir,
Əf'al yox, ancaq işimiz
qiybəti-zəndir,
Min hiylə qurub
rütbeyi-ikram alırız biz,
Büxlü həsədə adət
edib kam alırız biz.

## XORTDAN

Aşqabadda bir neçə qəribə xortdan çıxıb. Heç kəs ilə işi yoxdur. Məgər o adamlar ilə ki məktəblərə və mədrəsəmizə dostdur və kömək edir. Həqiqət, bu xəbəri eşidib inanmadım və necə də inanmaq olar ki, mədrəsə və məktəb sevənləri xortdan yeyə, çünki məktəblərin paklığı cəhətinə div-şəyatin məktəblərdən qaçır. Amma dürüst təhqiq edəndən sonra mən özüm də çox qorxdum. Çünki xortdandan qorxuzanlar çox mö'təbər adamlardır. Deyim qumarbazdır - xeyr, şə-

rabxordur - xeyr, tiryəkidir - xeyr, çərsidir - xeyr, bəngidir - xeyr. Müxtəsəri, Molla əmi, çox-çox böyükdür, hətta əmmaməsi da var, elmi də var, mürafiəsi də var. Xülasə, hər zadı var. Belə ki, adamları tək-tək görəndə deyir: "Əzizlərim, nuri-didələrim, mən sizin xeyrinizi istəyirəm, məbada məktəbə və mədrəsəyə səmt düşəsiniz, allah eləməmiş, xortdana tö'mə olarsınız. İnsafən, Molla əmi, belə mö'təbər qorxuzanlardan sonra sən də qorxarsan və papağını mədrəsəyə, məktəblərə atsalar, gedib götürməzsən. Bu əhvalı yazasız, biçarə mədrəsə və məktəb dostları xortdandan ehtiyatlı olsunlar və xortdanları tanısınlar".

**Qorxaq**

---

## *LEYLƏK VƏ İBRAHİM QUŞU*

Leylək - Ey qonşu, səni keçən illər Orenburqda gördüm, sənin əsl adın Əbdürrəşid İbrahimov deyilmi?

İbrahim quşu - Bəli, bəli!

Leylək - Xeyir ola, sən hara, Yaponiya hara, nə əcəb gəlmişsən?

İbrahim quşu - Sənin kimi altı ay bir yerdə, altı ay digər yerdə yatan deyiləm ki!

Leylək - Axır yumurtlamaq, bala çıxarmaq, onları bəsləmək, bir iş meydana gətirmək üçün bir az bir yerdə qalmaq lazımdır.

İbrahim - Eh, meydana bir iş çıxaracağam deyə bir yerdə yatmağın nə ləzzəti var? Gərək yerdən-yerə sıçrayasan, təzə-təzə məmləkətlər, təzə işlər görəsən!

Leylək - Təzə işləri yalnız gözünlə yox, gərək əlinlə də görəsən! Öz yuvanı, öz yerlərini də gərək təzələndirəsən!

İbrahim - Qa qa qa qa qa!.. Heç ata-baba işlərini, köhnə müqəddəs adətləri dəyişdirmək olurmu? Bizim Kazan tərəfindən olaydın, səni çoxdan təkfir etmişlərdi, şükür et ki, məcus məmləkətindənsən!

Leylək - De görüm, bu yaponiyalılar xoşuna gəlirmi? Sənə hörmət edirlərmi?

İbrahim - Pəh, nə cür hörmət! Biçarələr indiyə qədər İbrahim quşu görməmişlər.

Leylək - Burada kimlərin bağçasına qondun və kimlərlə söhbət etdin?

İbrahim - Böyük alimlərdən yaşı keçmiş qraf Okuma ilə söhbət etdim. Çox doğru sözlü adamlardır. Mənə dedilər ki, biz ruslar ilə dava etmək istəməzdik, amma onlar bizim üstümüzə hücum etdilər.

Leylək - Yaxşı, sən də o mədəni sözləri uddunmu?

İbrahim - Nə demək, qraf Okuma alim adamdır.

Leylək - Yaponların mədəniyyətini nə cür tapırsan?

İbrahim - Yaponlar çox xoşuma gəlir, dünya üzündə heç belə millət olmaz, mədəniyyətcə avropalılara çatmışlar. Amma bununla belə, öz qədim adətlərini heç buraxmamışlar. Çoxu küçə və sokaklarda yalınayağ və ya ağac başmaq, uzunsaç və öz milli əlbəsələrilə gəzirlər. Oxumuşları da belədirlər, hətta öz əlifbaları nə qədər çətin olsa-olsa genə dəyişdirmək istəmirlər.

Leylək - Cavanları ilə də görüşdünmü? Onlar da qədim adətlərindən razımıdırlar?

İbrahim - Cavanları ilə nə işim? Qraf Okuma belə onlardan şikayət edib dedi ki, bir para cavanlarımız əlifbamızı və bə'zi köhnə adətlərimizi dəyişdirmək istəyirlər, amma, inşallah, dedikləri olmaz.

Leylək - Teatrları nə cür, çoxmu?

İbrahim - Tamam-tamam təəccüb etdim. Bu millət teatra da məktəb qədər əhəmiyyət vermiş. Böyük və zinətli teatrları var, hər gecə adam ilə doludur. Çox ağıllı millətdirlər.

Leylək - Yaxşı, sən deyirdin köhnə adətlərindən əl çəkmirlər, Avropanın əxlaqından, adətindən heç bir şey qəbul etməmişlər. Məgər bu teatrlar Avropa əxlaqından, Avropa adətindən deyilmi?

İbrahim - Avropa adətindən olsa da, yaxşı adətdir, sənin lazımlı ehtiyacından biridir.

Leylək - Vay, nə deyirsən? Sən deyildin keçən illər müsəlman teatrını pisliyən? Sənin yoldaşların "Din və məşəqqət" deyilmi onu haram edən?

İbrahim - Burada mənə xəcalət verməyin nə yeri? Sus, yaponlar duyarlar. O sözlər Kazanda qaldı.

Leylək - Lək lək lək lək!.. Yaxşı, yapon arvadlarını nə cür gördün?

İbrahim - Çox tərbiyəli, çox ağıllıdırlar. Bunlar da qədim adətlərini tamam saxlıyırlar. Bir kişi ilə görüşəcəkləri vaxt bizlərdə namazda səcdəyə varan kimi, onlar da yerə yatıb səcdə edirlər, sonra durub danışırlar, amma danışanda gözlərilə heç baxmırlar. Çox tərbiyəlidirlər.

Leylək - Üzləri açıqmıdır?

İbrahim - Tamam avropalılar və Dağıstan müsəlmanları kimi açıqdırlar.

Leylək - Yaxşı, o halda sən onlara nə cür ağıllı deyirsən ki, üz açmağı haram bilmirlər?

İbrahim - Bağışla, mənim daxi vaxtım yoxdur, bunu Quba qazisindən xəbər al. Hələ xudahafiz, qismət olsa Kitayda görüşərik.

**Leylək**

## E'LAN

Gəncədə Şah Abbas məscidinin hücrələrində təzə açılan müalicəxanada naxoşlar qəbul olunur. Sübh əzanından şam əzanınadək. Xahiş edənlər buyursunlar.

Müalicəxananın müdirləri məşhur professorlar Şeyx Mahmud və Hacı Molla Hüseyn gəncəli.

## ZÜLM

Zülm, zorbazorluq və mərdimazarlıq yaxşı iş deyil, bunu gərək hamı bilsin, ələlxüsus, irəvanlılar.

Biz bunu eşitmişik ki, İrəvan müsəlmanları hər bir yerdə və hər bir ittifaqda qonşularına zülm eliyirlər, amma genə inana bilmirdik.

İrəvandan indi bizə elə bir xəbər yazırlar ki, doğrudan, adamın az qalır bağrı çatdasın.

A kişi, bu yekəlikdə də zülm? Bu dərəcədə hüquq pozmaq?

Məsələn, pasxa bayramında ermənilər və ruslar küçəyə çıxan kimi görüblər ki, küçələr doludur fayton ilə və keyfli müsəlmanlar faytonlara minib bayram saxlıyırlar. Uruslar da və ermənilər də qayıdıb gediblər evlərinə. Çünki görüblər ki, müsəlmanlar onların bayramını zəbt eliyiblər, yə'ni onların hüquqlarını pozublar. Vaqiən, çox nainsaflıqdır, çünki heç bir kəs gərək min illik qonşunun hüququnu bu dərəcədə pozub incitməyə razı olmaya.

Dəxi yazıq xaçpərəstlər bayram eləmədilər.

Bu dərəcədə zülm?

**Anaş qurbağa**

## POÇTA QUTUSU

.....................

Nuxada "Qorodskoy şagird"ə: Dünən yazılan mətləbə bu gün dübarə əl vurmağın ləzzəti yoxdur.

.....................

Şahtaxtında "Murdar"a: Bu nəsihəti siz də yadınızda saxlıyın.

.....................

Səkkizinci nömrəmizdə "Vəssalam" imzası ilə yazdığımız məqalə barəsində Əylisdən bir neçə şəxs bizə yazırlar ki, əvvəla, pulun qədəri yetmiş iki manat deyil, otuz bir manat altı şahıdır və ikinci, haman pullar 1326 tarixdə məhərrəm ayında camaatın səlahiyyəti ilə tapşırılıb Hacı Həsən Rza oğluna və o da camaatın əli ilə lazım olan yerə sərf edib.

.....................

Gəncədə "Qeybət qarğası"na: Şe'rləriniz hələ kaldır.

.....................

Astarada "Mirzə kəfənsiz"ə: Məktublarınız çox mə'nalı və əhəmiyyətlidir. Amma çox heyf ki, İran işlərinə qarışmağa bizə hələlik ixtiyar verilmir.

Müdir və baş mühərrir

Cəlil Məmmədquluzadə.


**Badkubədə Mehmanxaneyi - "İslamiyyə"**

**Гостиница "ИСЛАМИЯ" въ гор. БАКУ.**

**Nömrələrinin qiyməti 1 manatdan beş manata qədərdir və aşpazxanamızda hər cür Asiya və Avropa xörəkləri mövcuddur. İstirahətini sevən müştərilərdən mehmanxanamızı bir dəfə gəlib görmələri rica olunur. Pasroptsuz müsafirlər zəhmət çəkməsinlər, çünki divan hökmünə görə qəbul olunmuyacaqlar. Adresimiz: Qubernski küçədə, Lalayevin evində Mehmanxaneyi-"İslamiyyə".**

**Sahibi-mehmanxana: İsmayıl Mahmudzadə.**

**Баку, Губернская ул., номера "ИСЛАМИЯ", телефон 1251.**


## E'LAN

Bir nəfər gimnaziya qurtaran gürcü qızı müsəlman evində qız və oğlan uşaqlarına tərbiyə və dərs vermək istəyir. Altıncı klasadək dərs verə bilər. Özgə şəhərə də getməyi qəbul eliyir. Xahiş edənlər "Molla Nəsrəddin" idarəsindən soruşsunlar.

Jurnalımızın təzə və köhnə nömrələri və kitabları Bakıda satılır Parapetdə, Varonsovski - Vrangelski küçələrinin küncündə, Məşədi Əyyub Ələkbərovun dükanında. Xahiş edənlər oraya təşrif gətirsinlər.


**Tiflisdə Mehmanxaneyi-"Dağıstan"**

Nömrələrinin qiyməti yarım manatdan üç manata qədərdir. Hər cür Asiya və Avropa xörəkləri gətirtmək olar. Təmiz və işıq nömrələrimiz çox rahatdırlar. Pasportsuz qonaqlar zəhmət çəkməsinlər, çünki divan hökmünə görə qəbul olunmuyacaqlar.

Adresimiz: Tiflis, Peskovski küçədə, nömrə 93, təzə müalicəxananın qabağında, konka duran meydanın yanında.

Sahibi mehmanxana: İsa Kərbəlayı Cəfər oğlu gəncəli.

Тифлисъ, Песковская ул.,д. № 93, противъ новой лечебницы д-ра Григорьяна номера "ДАГЕСТАНЪ"

TƏZƏ AÇILAN MÜALİCƏXANA

"Тифлисская частная лечебница"

Вокзальная 8, д.Энфиаджианца

Телефонъ 695

İ.Q.Fyodorov - İçəri və uşaq azarının həkimi. Qəbul edir hər gün çaharşənbə və bazardan savayı saat 11-dən 12-dək.

V.D.Qambaşidze - İçəri və uşaq azarı. Hər gün bazardan savayı saat 12-dən 1-dək.

B.A.Popov - Boğaz, burun və qulaq həkimi. Hər gün bazardan savayı saat 12-dən 1-dək.

Q.M.Makarov - İçəri və uşaq azarlarının həkimi. Tək və cümə günləri 1-dən 2-dək.

A.N.Diasamidze - Siflis, dəri və süzənək. Hər gün 11 yarımdan 12 yarımadək.

N.M.Melikov - Cərrahlıq və övrət azarları. Hər gün 1-dən 2-dək.

İ.Q.Qumarteli - İçəri və uşaq azarı. Hər gün 2-dən 3-dək.

V.S.Musxilov - Göz azarı. Hər gün bazardan savayı 2-dən 2 yarımadək.

**Axşamlar**

A.Q.Mirzoyev - İçəri və uşaq azarı. Hər gün bazardan savayı 5-dən 6-dək.

N.Q.Çiçinadze - İçəri və uşaq azarı. Hər gün bazardan savayı 6-dan 7-dək.

Müalicəxanada hər bir azar elm yolu ilə təhqiq olunur, habelə çiçək döyülür və əmzikli övrətlərə də baxılır. Məsləhətə gələnlərdən 50 qəpik alınır.

## E'LAN

1. "Hesab məsələsi" (Задачник). Bu kitab məktəblərdə və evlərdə hesab tə'limi üçün tərtib olunub, 761 hesab məsələsini, 237 tə'limati-rəqəmiyyəyi və Rusiyada iste'mal olunan ölçüləri və ölçülərə dair tə'limləri havidir. Qiyməti 35 qəpikdir.

2. Gündəlik dərsləri yazmaq üçün yövmiyyə dəftəri (Дневник).

Şagirdlərə gündəlik, həftəlik, aylıq və illik nömrələr qoymaq və dərsləri yazmaq üçün cədvəlləri və bə'zi digər mə'lumatı havidir. Qiyməti 30 qəpik.

Bu kitabları almaq istəyən müəllimlərə və kitabçılara böyük təfavüt qoyulacaqdır. On ədəddən əskiyinə poçta markaları qəbul olunur. Xahiş edənlərə naloj ilə göndərilir.

**Adres: Gəncədə Həmidbəy Yusifbəyova.**

**İDARƏMIZDƏ SATILAN KITABLAR**

| Kitabların adları | Yazanlar | Qiymətləri | |
|---|---|---|---|
| | | idarədə | poçta xərcilə |
| Dərs kitabları: | | | |
| Vətən dili, əvvəlinci il üçün dərs kitabı | Çernyayevski | 35 qəp. | 40 qəp. |
| Türk əlifbası | Müəllim M.Mahmudbəyov | 20 qəp. | 24 qəp. |
| Birinci kitab, əvvəlinci il üçün dəsr kitabı | Gəncə müəllimi Mirzə Abbas Mollazadə | 20 qəp. | 24 qəp. |
| Uşaq bağçası, əvvəlinci il üçün dəsr kitabı | Rəşidbəy Əfəndizadə | 25 qəp. | 30 qəp. |
| Bəsirətül-ətfal, ikinci il üçün dəsr kitabı | -*--*--*- | 25 qəp. | 30 qəp. |
| Məşq məcmuəsi | Mirzə Abbas Mollazadə | 8 qəp. | 10 qəp. |
| Qiraət kitabları: | | | |
| Təşrihül-fəraiz | Axund Araszadə | 1 man. | 1man. 16 qəp. |
| "Rüstəm və Söhrab" (gözəl şəkilli) | Abbas Ağa Qayıbov | 1 man. | 1man. 20 qəp. |
| Bizə hansı elmlər lazım | Axund Əbuturab mərhum, Ə.Hüseynzadə, Faiq Ne'manzadə və Molla Nəsrəddin | 15 qəp. | 20 qəp. |
| Usta Zeynal (şəkilli) | Molla Nəsrəddin | 15 qəp. | 17 qəp. |
| Qurbanəlibəy (-*-) | -*--*--*- | 15 qəp. | 17 qəp. |
| İranda hürriyyət (-*-) | -*--*--*- | 1[illegible] qəp. | 1[illegible] qəp. |
| Millət dostları | Haqverdiyev | 5 qəp. | 7 qəp. |
| Şeyx və vəzir (farsca) | Mirzə Mülkümxan | 20 qəp. | 24 qəp. |
| Məbdəi-tərəqqi (farsca) | -*--*--*- | 5 qəp. | 7 qəp. |
| Həqiqəti-islam | Axund Yusif Talıb-zadə | 50 qəp. | 50 qəp. |
| İslam tarixi (birinci hissə) | -*--*--*- | 45 qəp. | 45 qəp. |
| İslam məmləkətlərinin xəritəsi | -*--*--*- | 25 qəp. | 25 qəp. |
| Müəllimüş-şəriə (birinci hissə) | -*--*--*- | 40 qəp. | 40 qəp. |
| Müəllimüş-şəriə (ikinci hissə) | -*--*--*- | 50 qəp. | 50 qəp. |
| İki uşaq | Mirzə Abdulla Talıb-zadə | 20 qəp. | 20 qəp. |
| Qanlı müsadimə | -*--*--*- | 5 qəp. | 5 qəp. |
| Asari Əhmədbəy Cavanşir (milli şe'r məcmuəsi) | -*--*--*- | 25 qəp. | 30 qəp. |

***Şagird dəftərləri: idarədə yüz dənəsi 2 manat 40 qəpik. Nalojnı vasitəsilə istəyənlər hər sifarişə 17 qəpik artıq poçta xərci verəcəklər.***

IV ГОДЪ ИЗДАНИЯ № 14 АПРЕЛЯ 5-ГО 1909г.

# “Молла Насрединъ”

*КОНТОРА и РЕДАКЦИЯ*
журнала
“Молла Насрединъ”
Тифлисъ
*Давидовская ул., д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКИЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

***ЦѢНА на ГОДЪ***
*Съ доставкою..............5 руб.*
*За границу....................6 руб.*
***ЦѢНА за ОБЪЯВЛЕНИЯ***
*За место занимаемое строкою*
*петита впереди текста .....10 коп.*
*позади * * * .....7 коп.*




Möhlət ilə verilir
Bir manatadək
Bir manatadək
Əl maşınları - 25 manatlıqdan başlamış
Rusiyada məhz öz mağazalarımızda satılır.
Tiflisdə üç məxsusi şö’bə var:
1. Qalovinski küçədə, Mirimanovun evində, Sərdar imarətinin qabağında.
2. Vağzal küçəsində, İnficiyansın evində.
3. Avlabarda, Kaxetinski küçədə, Həsən Calalovun evində.
Hökumət tərəfindən təsdiq olunmuş mağaza lövhəsi
Fabrika əlaməti
Saxtalarından ehtiyat edin.








Peterburqda “Mexaniçeski” şirkətinin çox ə’la ayaqqabıları.

Rantavoy tikilmiş və vintli, hər fasonda. Hər bir böyük mağazada satılır.





Əsl malların üstündə belə bir nişan var. Rus-Amerika rezin manufakturasının şirkəti Firması “Triuqolnik”

(Üçguşəli)

## ТРЕУГОЛЬНИКЪ

Haman yerdə dəri skladı və bə’zi zaqraniçni mallar
və Rus-Amerika rezin qaloşları manufakturasının Peterburqun
“Mexaniçeski” şirkətinin ayaqqabılarından
ötrü “krima” və “apritura”.



Başı ilə işləyən



Ağzı ilə işləyən

Bədənin hansı üzvü çox işləsə - böyüyür və qüvvət tapır. (Həkim nəsihəti)



Pəh, pəh, pəh, bu da sənə məşrutə, məgər keçən padşahların ağlı yox idi? Əgər bilsəydilər ki, məşrutə yaxşı zaddır - çoxdan vermişdilər.

Xala, vallah, bu sənin tə''rif elədiyin oğlan deyil, öldürsən də mən ona getmərəm.



Qızım, xalan sənə qurban, səni bir oğlana vermişəm ki, onun kimi gözəl və yaraşıqlı heç bu kənddə yoxdu.

ملا نصر الدين

№15. Цѣна 12 к. МОЛЛА НАСРЕДДИНЪ قیمتی ۱۲ قپك ۱۵

Разсыльный консульск. агента и персидск. подданный.



Xan: Ya çıxart mənə yarım manat ver, yoxsa səni aparram nayib səndən beş manat alar.
Rəiyyət: Başına dönüm, xan, ancaq Rəhim xanın qırğınından yaxamı qurtarıb qaçmışam, budur, paltarımdan savayı bir şeyim yoxdur. (Ağdamda)

Gəncədə şəhər qiraətxanası

"Sahib - mənsəbə ehtiram lazımdır".

Şəhər upravası qiraətxanaya gələnlərdən təvəqqə edir ki, qəzet oxumaqdan savayı özgə işlə məşğul olmasınlar.

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д. 24.*

**Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.**

Тифлисъ, "Молла Насреддинъ"
Редакция журнала "Молла Насреддинъ"

**E'lan qiyməti**

**Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.**
**Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.**

**4 rəbiül-axər, 1327, bazar** **Həftədə bir dəfə çıxan türk məcmuəsidir** **12 aprel 1909**

**"TƏHRİRƏL-MƏRAH" VƏ "ƏLMƏRAHÜL-CƏDİDƏT"**

Alimi-məşhur Qasımbəy Əmin ərəbcə yazdığı və ədibi-möhtərəm Zakir Əlqadiri cənabları türk dilinə tərcümə etdiyi həmin kitablar xanımları əsarətdən qurtarmağa dair şirin dil və mə'nalı dəlillər ilə bəhs edirlər.
Övrətlərin azadlığını arzu edənlərə bu kitabları alıb oxumağı məsləhət görürük. Hər birinin qiyməti 35 qəpikdir. Xahiş edənlər Orenburq quberniyasında Orsk şəhərində Əhməd Əlishaqi cənablarından istəsinlər.
г.Орскъ, Оренбургск. губ. Ахмеду г.ИСХАКОВУ.


1897







"PRAVODNİK" şirkətinin

*Tiflis, Salolak küçəsində, nömrə 4.*
*Тифлисъ, Сололакская ул. № 4.*

Zaqafqaziyada fabrika anbarı
Tə'mirat mövsümü münasibəti ilə

**Проводникъ-Линолеумъ**

Pravodnik-linoleumu
alıb otaqların fərşinə döşəməyi məsləhət görürük.

Linoleum olan yerdə dəxi parket, polların rənglənməyi, nəqşi, fərşi, qalı-qalça, kənarə, müşənbə və qeyr şey lazım deyil. Hər qisim fərşə döşənən şeylərdən linoleum o barədə yaxşıdır ki, cövhəriyyatın tə'sirindən xarab olmur, yeriyəndə səslənmir, asan təmizlənir və həmişə gözəldir.

Özü ucuz ola-ola linoleum
möhkəmlikdə, asanlıqda və göyçəklikdə indiyədək şöhrət tapan cəmi otaq fərşlərinin cümləsindən birinci yer tutur.
Buna da şahiddirlər haman töhfələr və təsdiqnamələr ki,
"Pravodnik" şirkətinə rus və əcnəbi sərgi-
(выставка) lərində verilibdir.

Linoleumun nəqşləri və hesabı tələb olunan kimi göndərilir.



## ƏTTÖVBƏ

İmdadə sən yet, Ey adil allah.
Pis gündəyiz çox, Rəhm eylə eyvah.
Bu xəlqi etdi Kim belə gümrah?
Gör bir nə söylər Bu qövmi-bədxah:
Övrət müsavat, Əqvalə bah-bah,
Əttövbə, tövbə. Əstəğfürullah.

Hürriyyət olsun, Getsin əsarət.
Həm tərk edilsin. Hali-bədavət.
Övrətlər etsin Kəsbi-şərafət.
Qızlar məkatib, Elmi-sənaət,
Yarəb! Nə bid'ət, Bu nə cəhalət?
Əttövbə, tövbə. Əstəğfürullah.

Hansı günahı Etdik cəhanda,
Qıldıq təsadüf Boylə zamanda.
Qaldıq necə gör Biz əl-amanda,
Gila rəiyyət, Həm bəydə, xanda.
İstər ədalət Pirü cavan da,
Əttövbə, tövbə. Əstəğfürullah.

Dərdim daşıbdır, Dinmə filanı,
Qanmır bu firqə. Yaxşı, yamanı.
Derlər ki, getsin Cümlə zənanı,
Təhsili-elmə. Faşü nəhanı,
Billah atıbdır Bunlar həyanı,
Əttövbə, tövbə. Əstəğfürullah.

Getsinlər dərsə Fatma və Zöhrə,
Bundan mənə de Olsun nə bəhrə!
Qalsın bucaqda Bu paslı cəhrə?
Bunlar uyuşsun Coğraf, cəfrə,
Qeyrət olarmı Razı bu əmrə?
Əttövbə, tövbə. Əstəğfürullah.

Ax! Ey müşəvvəq, Lal olsan ey kaş,
Qaldın nəçün sən Hər mətləbi faş?
Gər olsa qızlar Elm ilə sirdaş,
Onda kim oynar. Qəcəmə, beş daş?
Boylə gedərsə İşlər olur yaş.
Əttövbə, tövbə. Əstəğfürullah.

Yox! Yox! Olammaz Boylə zərafət!
Bərdar edinməz Bu nəngi millət.
Qızlar sərasər Bilsin kitabət?
Etməz cəmaət Boylə qəbahət.
Kim xaricilər Etsin şəmatət.
Əttövbə, tövbə, Əstəğfürullah.
Heyran və matəm. Vallahü billah.

**Keyfsiz**







(13-cü nömrədən mab'əd)

İlin axır çaharşənbəsi növbət gəldi Dingiliş xanıma:

Güzgünü atdım bayıra,
Başmağı atdım çayıra.
Yığılın qövm-qardaş,
İşmiz dönübdür xeyirə.

Əlini salıb bir gözmuncuğu çıxartdı. Bu muncuq Dınqır Məşədi Yaxşı xalanın niyyətinə çıxdı.

Növbət gəldi Balağıbatdax bacıya:

Bir dəvə gəlir yüklücə,
- Topuğunadək tüklücə,
Allah muradın versin,
- Gəl bozbaş yeyək bu gecə.

Əlini salıb bir əqiq çıxartdı. Bu əqiq Bibixanım xalaya.

Sədr: Niyyətin nədir?

Bibixanım xala: Dedim görüm camışım erkək doğacaq, yoxsa dişi.

Sədr: Erkək doğacaq.

Növbət gəldi Xatun xalaya:

Yolun bazara çıxdı,
Bazardan minarə çıxdı.
Bildirki sınıq könlüm,
İndi kənara çıxdı.

Əlini salıb bir haçar çıxartdı. Mal dəyənəyi irəli durub dedi: O haçar mənimdir, bəxtim bağlanıb, məni ərə alan yoxdur.

Sədr: Bildirki sınıq bəxtin indi kənara çıxdı.

**Dabanıçatdaq xala**

---

## HAMAN SÖZ

Genə haman sözdür ki, neçə dəfə yazmışıq. Genə köhnə məsələdir.

Kimdir Sultan Əbdülhəmid?

Bu barədə çox danışılıb. İndiyədək Sultan barəsində nuxalılar ilə, şamaxılılar ilə və dağıstanlılar ilə bizim aramızda bir növ mübahisə əmələ gəlib. Yə'ni sözümüz bir-birimizə xoş gəlmiyib.

Sultan söhbəti düşəndə onun gədaları həmişə istəyiblər sübuta yetirsinlər ki, Sultan Əbdülhəmid xan sani əfəndimiz həzrətləri hamiyi-şəriəti-Məhəmmədiyyə, xəlifeyi-islam və himayəgahi-ülum və maarif olan bir zatdır.

Amma biz bunun cavabında demişik ki, Sultan Əbdülhəmid sani Osmanlı məmləkətinin və bu məmləkətdə yaşıyan cəmi millətlərin düşmənidir və Osmanlı taxtına dırmaşıb qalxandan indiyədək bu otuz altı ilin ərzində gecə və gündüz fikri o yerdə olub ki, məmləkəti məhv eləsin, yə'ni puça çıxartsın.

Heç kəs indiyədək bizim sözümüzü təsdiq eləmiyib. Hamı elə bilib ki, Sultan ilə bizim ata-baba davamız var, şəxsi ədavətimiz var. Bir tərəfdən "həblül-mətin"lər və Qafqaz qəzetələrimiz Sultan barəsində uzun-uzun şahnamələr yazıb camaatı istəyiblər öz tərəflərinə çəksinlər, bir tərəfdən də Avropada və Misirdə Sultan Əbdülhəmidin təqsirnamələrini nəşr eliyən osmanlı mücahidlərinin qəzetələri camaatımızın nəzərinə çata bilmiyib.

Odur ki, indiyədək meydanda qalmışıq tək.

Baha! İndi gör nə var!

İndi cəmi qəzetələr başlıyıblar Sultanın vətənə göstərdiyi düşmənçiliyi isbat eləməyə. Çünki indi eşidiblər ki, cavan türklərin qoşunu Sultan Əbdülhəmidi istəyir taxtdan itəliyib salsın aşağa.

Genə bunlar hamısı ötüşüb keçən işlərdir.

Amma bircə şey ötüşüb keçməyəcək. Söz yox, maarifpərəstlərimizdən çoxları tapıla bilər ki, bə'zi qəzetələri əvvəlinci nömrəsindən ilin axırınadək yığıb kitab bağlıyırlar ki, sonra hərdənbir alıb köhnə işləri yada salsınlar.

Əgər indi birisi açıb qəzetə kitabını vərəqləyə və Sultan barəsində yazılan sözləri oxuya, onda baxıb görəcək ki, dünən yazılıb, Sultan Əbdülhəmid xan sani əfəndimiz həzrətləri, hamiyi-şəriəti-Məhəmmədiyyə, xəlifeyi-islam və himayəgahi-ülum və maarif...

Amma haman qəzetənin o biri nömrəsində oxuyacaq ki, Osmanlı məmləkətinin parçalanmağına, ülum və maarifin məhv olmağına və indi də İslambulda qanların axmağına səbəb bir zat olubdur, onun adı Əbdülhəmid xan sanidir.

Mən elə bilirəm ki, hər bir şey ötüşsə, bu ötüşməz.

**Molla Nəsrəddin**

---

## BAHAR FƏSLİ

Martın 19-da Hacı Möhsün adında bir Xorasan qaraçısı bir dənə cavan mütrüb ilə iyirmiyə qədər də ayaqyalın Xorasan lütlərindən yığıb gətirib Əfrasiyab çölündə bir sirk tərtib vermişdi. Hərçənd ayrı millətlərin sirkində at oynar, keçi oynar, meymun oynar, lakin nə eləmək, bizimkində də gərək adam oynasın. Hələ görüm dəxi nə deyəcəkdim?.. Və bir də şəhərimizə yaxşı xoşsifət, boynuyoğun dərvişlər də təşrif

gətiriblər. İndi deyəcəksən nə olar; İrandan da Qafqaza çoxlu boynuyoğun mərsiyəxanlar gəlir. Doğrudur, amma bu qələndərlərin şəhərimizə gəlməyindən şəhərimiz çox rövnəqlənib; necə ki bahar fəslində bağa gedəsən qulağa hər ağacdan bir bülbül, hər şaxədən bir əndəlib sədası gəlir, Afrika meşələrində də belə xoşsifət bülbüllərin səsin eşitmək olar.

**İmza: Bir nəfər Səmərqənddən yazan**

## GƏNCƏ

### BÖHTAN

Müsəlmanların böhtançı olmağına mən indiyə kimi heç inanmaz idim. Amma bu günlərdə bizim Gəncə müsəlmanları, o da müsəlmanların lap zübdələri iki bigünah allah bəndəsinə elə qırmızı böhtan sarıdılar ki, adamın lap ağlı çaşır. Bir para bikar adamlar tutub Şah Abbas məscidinin qapısındakı səkiləri ki neçə vaxtdan bəri camaat malı olmuşdu, uçurtdular. Bu səkiləri məscid bina olunandan onun-bunun təsərrüfündə görmüşdük. Burada ya möhür satardılar, ya məktubçuluq edərdilər, ya duanəvislik edərdilər. Hərçənd mal məscid malı idi, amma məscidə bir qəpik də verməzdilər. Bizlərdə məscid malı demək camaat malı deməkdir. Odur ki, məscid malına hər kəs sahib ola bilər, hər kəs onu uda bilər. Burada ancaq bir şey nəzərimə gəldi. Deyəsən, bizim məscidin səkiləri bina olunanda onun baniləri müctəhid Ağa Molla Mə'sumun "İxtiyarat"ına baxıb saat xoşlamıyıblar. Odur ki, şeytan da bu səkilərin palçığına tüpürüb və səkilərə bir cür qəribə xasiyyət verib. Belə ki, hər kəs onların üstündə bir az otursa, o saat xasiyyətini dəyişir, öz zatını bildirir. Məsələn, səkilərin birində həmişə Gəncə fəxri Hacı Molla Atakişi oturardı ki, axırda da zatını yaxşıca bildirdi. Deməli ki, bizim səkilərimiz bir cür məhəkdir. Hər kəsin zatında bir azca şübhəsi olmuş olsa, buyursun bir az onların üstündə əyləşsin... Bu axırlarda da səkilərin birində rozəpəz Molla Cəlil otururardı. Yazığın yaxasından yapışıblar ki, sən şərab, araq və ya nə zəhrimar içirsən evində iç, orada da yat, məscid ağzına gəlib camaatımızı xarab eləmə. Çünki camaat uşaq kimi bir şeydir, mollalar da camaatın atası, böyüyü və ağasıdır; böyük nə eləsə uşaq da onu götürəcək. Yazıq molla, bigünah molla... Təqsir hamısı səkidə idi, allahın da qəzəbi onu tutdu, vurub uçurdular. Doğrudan da, mollamız böhtan qurbanı oldu, çörəkdən düşdü... Allah özü böhtançılara insaf versin.

....................

Böhtan qurbanının biri də şəhər qiraətxanasının gözəl-göyçək müdirəsi oldu. Deyirlər ki, gözələ baxmaq savabdır, göz yaranıbdır məhz gözələ baxmaqdan ötəri. Gözəli seçmiyənin gözü görüm kor olsun. Bizim "Uprava"da camaatı savab sahibi etməkdən ötəri qiraətxanaya bir gözəl rus xanımı qoyublar. Çibin şirinə toplaşan kimi, bizim cavanlarımız da sabahdan-axşama kimi qiraətxanaya toplaşırlar... kitab, qəzetə oxumağa... Həm qiraətxanaya pul gəlir, həm xanımın xətri xoş, həm də cavanlarımız savab sahibi olub keyfləri kök olur. Amma sözüm bunda deyil... Götürüb qəzetə yazıblar ki, qiraətxana müdirəsi şuluqluq eliyir, "Qlava"mız da götürüb bir kağız yazıb ki, qiraətxanaya qəzetə oxumaqdan başqa ayrı bir niyyət ilə gəlmək qadağandır... Ayrı niyyət, yə'ni çe? Yazıq xanım nə bilsin ki, kim qəzetə oxumağa gəlir, kim savab qazanmağa... Qiraətxana da onun vaxtından bəri yaman tərəqqi etməkdədir, həmişə arı səbəti kimi doludur.

Dünən eşitdim ki, haqşünas gəncəlilər bir adama üç ən'am hazırlıyıblar. Biri bir qara baydaqdır ki, üstündə ağ yazı ilə yazılacaq "camaat, mən məclisi-ruhaniyyədə sekretaram", özünü də cənab xanın Buxara papağının qabağındakı sarı dəmirin üstünə nəsb edəcəklər ki, dünyada nələr varmış. Biri bir sarı mahud parçasıdır ki, onu tikəcəklər xanın "formalı dujurkası"nın dalına, üstündə də yazısı olacaq bu məzmunda: "Camaat, bu xanın başına baxın" və biri də yay yaxınlaşmağına görə kanselyariyanın qabağında bir fəvvarə qayıracaqlar, otaqda da yeni ixtira olmuş havanı sərin edən elektrik maşınlarından birini qoyacaqlar ki, istidə xan zərbə düşüb iş görəndə tuman-köynəyini çıxartmasın... Amma, Molla əmi, bircə şeydən qorxuram, gəncəlilər vəfasız olalar, bu əhdlərinə vəfa eləmiyələr. Qorxuram genə də camaat cənab xanı "strajnik andır afserinə" oxşada, genə də isti düşəndə xan tuman-könəyi çıxardacaq...

**Müxlisiniz: Uzundraz Armudan bəy**

## BAYRAM

Ay Molla Nəsrəddin kirvə, a canım, səni din, səni məssəb, bircə bura gəl, tez ol bircə bu Aşqabada bax. A canım, belə də zad olar? Əşi, bu gün dörd gündür biz Səmərqənddən Aşqabada gəlmişik qızıl yumurta almağa görə, qohumlarımızla bayramlaşmağa. Qohumlarımız kasıb olduqlarından qasdinsiyada mənzil eləmişik. Əşi, İncil, Qur'an, kəlisa, məssəb haqqı, bu dörd gündə hər gecə bir qasdinsiyaya düşmüşük. Desən niyə? Sizin bu behiştdə məlaikələr ilə qol-boyun olan musurmanların haray-huraylarından. Əşi, din, məssəb haqqı, hansı qasdinsiya, hansı nömrəyə, hansı restorana gedirsən, doludur musurman ilə. A canım, əgər bu sizin bayramınızdır, dəxi biz heç, ya əgər bizim bayramımızdır, siz nə qələt eliyirsiniz, ayıb deyilmi? Heç utanmırsınız? Bir yerə gedirsən görürsən keyflənib qarışıblar bir-birlərinə. Parsicə oxuyurlar. Faytonlar dolu keyfli musurmanlar ilə. Qarabağı oxuyan, qaval, tar, urra, urra, pəhpəh-pəh. Qərəz, a Molla, din, məssəb haqqı, hansı qasdin ya

nömrəyə getmişik, bu musurman qardaşlarının çığır-bağırından dəxi sübhə kimi yatmamışıq, yanımızda övrət-uşaq. Axırda gəlib vağzal yanında bir nömrədə yer tutduq ki, dəxi heç kəs buranı tapa bilməz. A başına dönüm, gecənin yarısıydı, gördük şikəstə qarabağinin başı açıldı. Uşaqlar başladılar ağlamağa. Arvad dedi, çıxıb söyəcəyəm. Dedim, arvad, dəli olma, elmsiz musurman, o da keyflisi. Canından doyubsan? Qərəz, nə başını ağrıdım, sübhə kimi haray-huray, çığır-bağır, iç-haiç. Sabaha yaxın bir də gördük qoymahaqoyma düşdü. Di gəl ki, görəsən ağaların pulları qurtulub, əl xancala bir-birlərinə. Biz bunu görəndə tez yağışıb sübh açılmamış qaçdıq vağzala. Din haqqı, heç qohumlarımıza bir sələmət qalın da eləmədik. Andıra qalsın belə şəhər, belə bayram, belə musurmanlar. A canım, belə zad olar? Qərəz, yox olsun elmsizlik. Deyəsən, acığımızdan biz də Səmərqənd əvəzinə azıb ya Badkubəyə, ya cəhənnəmə gedəcəyik. A Molla, sən allah, bulara bir öyüd ver, axı sən mollasan.

**Müsəlmandan qorxan bir erməni**

## ZƏLİ

Allah babana rəhmət eləsin, bir kərə mənim rəhmətlik babam mərhum həkim Zoğalın buyurmağına görə bir neçə zəli gətirib günçıxan tərəfdəki qolunda olan yaranın pis və qəliz qanını sormağa qoymuşdu ki, qolu şəfa tapsın. O və'də mən yüz yaşında balaca uşaq idim, bu allahın belə xırda qurdlara oxşuyan balaca zəlilərinə baxıb çox təəccüb edirdim ki, bunların ən böyüyü görəsən nə boyda olar? İndi, a Molla əmi, dörd sənədir ki, bizim Zaqatal okruğunun hər uçastkasında həmin zəlilərdən bir neçəsi böyüklənib və başlarına əmmamə qoyub yayılıblar. Bunlar həqiqi zəlilər kimi xəstələri sağaltmaq əvəzinə sağların qanlarını sorub xəstələtmək kəramətinə dəxi qadirdirlər. Bu zəlilərə bizim yerdə şeyx deyirlərmiş. Əvvəla: Hacı Musa dəbir adında bir lotu neçə ildir ki, Dağıstanın bir naxırından çatını qırıb gəlibdir Cara və hər axşam namazdan sonra cavan övrətləri yığıb və lampanı keçirib başlıyır donbalaq aşmaq təriqətini işlətməyə! Saniyən: Balakən uçastkasında Kadex kəndinə təşrif buyurub İsa dəbir deyən bir dərd əhli çox ə'la teatr açıb. Cavanə və xoşsima müridlər məccanən qəbul olunur. İnşallah, Şeyx Sən'anın məqamına yetişəcək. Salisən: Hacı Osman əfəndi deyən bir zövq əhli neçə ildir ki, Zaxod kəndindən hicrət edib Lekit kəndinə təşrif buyurub, bir "Gülüstani-İrəm" tikib, həftə bazarı açıb, məsələn, avam camaatı tovluyub iməci ilə bir həftə Zoğal dibi, bir həftə... pirinə gedir. Özü də cənnəti tamam ixtiyar edib heç bizə yer saxlamıyıb. Rabiən: Əliabad uçastkasında Lahıc kəndində Hacı Qurban əfəndi adında bir nəfər şeyx ölüb, gecələr ərşə çıxıb məlaikələr ilə namaz qılır. Mö'təbər rəvayətlərə görə məzkuru cənnətə haçarçı tə'yin edəcəklərmiş və digəri Qımır kəndində Hacı Murad əfəndi adında bir nəfər ruh əhli çox ixlas ilə ibadət edib şeyx "Bərsisa"-nın məqamına daxil olmağa bir arşın yol qalıb!.. Xamisən: Falax kəndində Hacı Mustafa əfəndi adında bir qiyafətşünas mübarək üzünə pərdə salıb ərişərrəhmi səyahət etməyə getmişdi. Deyirlər səkkiz cənnətin cümləsini gəzib hər birində bir fincan abikövsər içib genə təbdili-hava üçün Falax kəndinə təşrif buyurub...

İndi, a Molla əmi! Təvəqqə edirəm Molla Abbas kitabına baxıb bir xəbər verəsən, əvvəla, Dağıstanın zəliləri cümləsi beləmi olur? Saniyən, bu əmmaməli zəlilər ki bişəkk cənnətə daxil olacaqlar, biz asi qullara cənnətin məhəlləsində də olsa yer olacaqmı? Yoxsa indidən ərizə verib qəndidat yazılaqmı?

**Sofi zənbil**

## ÇAQQAL

**"Meşə çaqqalsız olmaz"**
**(Atalar sözü)**

Səmərqənd meşələrində hər qisim heyvan var, lakin bu heyvanların içində axır vaxtlarda çaqqal görsənmirdi.

Bu da çox qəribə bir işdir. Çünki mə'lumdur ki, "meşə çaqqalsız olmaz".

Bu məsələ Avropa üləmasını çoxdan məşğul eləmişdi və neçə dəfələr ilə Avropadan və Rusiyadan səyyahlar dəstələri gəlib Səmərqənd meşələrini gəzib çaqqal tapmıyıb gediblər.

Daşkənd şəhərində çıxan "Türküstan" qəzetəsi yazır ki, axırda Səmərqənd meşələrində çaqqal da tapıldı və əhvalatı bu qərar ilə yazır.

Bir neçə ay bundan əqdəm Rusiya tatarları ədiblərindən möhtərəm Fateh Kərimi, Zakir Əlqadiri və Əhməd - Əlishaqi cənabları bir hey'ət təşkil edib Səmərqəndə tərəf azim olublar ki, çaqqaldan bir xəbər bilsinlər. Müsafirlər Səmərqənd meşəsinə daxil olub bir şey tapa bilmiyiblər və yorulub bir ağacın dibində oturublar ki, rahat olsunlar və bikarçılıqdan bir kitab açıb başlıyıblar oxumağa. Kitabın adı "Təhrirəl-mərat, yainki xanımları əsarətdən qurtarmaq" imiş. Yazanı Qasımbəy Əmin.

Ağalar kitabı açıb oxuyan kimi görüblər ki, bir ağacın yuxarısında bir heyvan uluyur və aşağı acıqlı baxa-baxa hirsindən ağacın budaqlarını gəmirtliyir.

Deməginən bu heyvan çaqqal imiş.

Bu səs şəhərə dağılan kimi xalq həyəcana gəlir və bir paraları istəmir inansın, bir paraları da cavab verirlər ki, xeyr, o heyvan çaqqal deyil imiş, bəlkə Səmərqənd müftisi Məhəmməd Bəqa xacə imiş. Xülasə, əhvalat bu cür olur, axırı nə olacaq - onu da allah bilər.

**Lağlağı**

## E'LAN

"Molla Nəsrəddin" vasitəsi ilə mollalığa imtahan tutub şəhadətnamə almaq qəsdi ilə Tiflisə təşrif gətirən cavanlara xəbər veririk ki, hər kəs cibinə on manat qoyub qabaqca gəlib müsəlmanların başının sahibini ziyarət eləməsə - ona şəhadətnamə verilmiyəcək və nə qədər elm oxumuş olsa imtahandan çıxmıyacaq.

**İmza: Bazarbalağı**

## TELEQRAF XƏBƏRLƏRİ

.....................

**İstanbul** - "İttifaqi-Məhəmmədi cəmiyyəti" ilə "Əhrar firqəsi" martın 31-ci gecəsi özlərinin istədikləri şəriət ilə elə dəhşətli namaz qıldılar ki, "Allahü əkbər!" sədaları bütün dünyaya vəlvələ saldı. Müqəddəs şəriətləri uğrunda yüzə yaxın qurban kəsildi.

.....................

**Hacıtərxan** - Molla Əbdürrəhim Əliyev cənabları "haram" və "kafir" möhürlərinin qiymətini üç qəpiyə yendirdi.

.....................

**Gəncə** - Müsəlman cəmiyyətlərinin qapılarına vurmaq üçün üç böyük "nal" Moskvaya sifariş edildi.

.....................

**Şuşa** - "Novaya Vremya" müxbiri yazır: Rus mühacirləri üçün hazırlanan yüz min desyatinlik Muğan səhrasının hamısını beş müsəlman xanəsi zəbt edir. Çox qorxu var ki, bunlar artıb altı xanə olalar. Dəxi ruslar üçün bir yer qalmır.

.....................

**Tomsk** (Sibiriyada) - Qırğız müsəlmanları axund və işanlarının və'zləri sayəsində mələk təbiətinə girib boş hava ilə də yaşıya biləcəklərindən, bu il bunların ata-baba yerlərinə bir milyon iki yüz min rus mühacirləri yerləşdirildi.

.....................

**İstanbul** - Kamil Paşa axırda muradına çatdı, Sultan da təbii xahişinə.

**Şəki** - Darülmüəllimin sözü şəkililərdən məhkəməyə şikayət etdi ki, niyə öz adını və mə'nasını yerində işlətmirlər.

## POÇTA QUTUSU

.....................

Naxçıvanda müştərimizə: Məktubunuzun çap olunmağına məcmuəmizə müştəri olmağınız kifayət eləmir.

.....................

Bakıda bir nəfər dostumuza: Heyf o vaxta ki, şe'r düzəltməyə sərf eliyirsiniz.

.....................

Gəncədə müəllimdən şikayət yazana: Yazdığınız işləri gözümüz ilə görsək, bircə o və'də çap edə bilərik.

.....................

Gəncədə "Cərrah"a: Məktubunuzda bir dənə biədəb söz qalan haqq sözlərinizi də xarab eliyir. Bu səbəbdən kağızı tulladıq.

.....................

Badkubə uyezdində "Vartan vay"ə: Xırda əhvalatlardan yazsanız, uzun məqalə yazmağınızdan xoş düşər və az-az çap edərik.

.....................

Bakıda Əbdülcəlilə: Yuxunuza cavab verilmiyəcək.

.....................

Vladiqafqazda "Dost"a: İki səhifənin əvəzində iki sətir də yazsaydınız, kifayət edərdi.

Müdir və baş mühərrir:
Cəlil Məmmədquluzadə.

## E'LANLAR

**"Kitabül-bəyan"**

adlı təfsirimiz iki cilddə tamam oldu. Hədiyyəsi cildsiz 3 manat 50 qəpik, mücəllid 3 manat 90 qəpikdən 4 manat 50 qəpiyədək. Poçta xərci 80 qəpik.

Тифлисъ, Воронцовская ул., фабричный тупикъ, д. N2. Гаджи Ахундъ Мовла-заде.

### E'LAN

Bir nəfər gimnaziya qurtaran gürcü qızı müsəlman evində qız və oğlan uşaqlarına tərbiyə və dərs vermək istəyir. Altıncı klasadək dərs verə bilər. Özgə şəhərə də getməyi qəbul eliyir. Xahiş edənlər "Molla Nəsrəddin" idarəsindən soruşsunlar.

Jurnalımızın təzə və köhnə nömrələri və kitabları Bakıda satılır Parapetdə, Voronsovski - Vrangelski küçələrinin küncündə, Məşədi Əyyub Ələkbərovun dükanında. Xahiş edənlər oraya təşrif gətirsinlər.

**Badkubədə Mehmanxaneyi - "İslamiyyə"**
**Гостиница "ИСЛАМИЯ" въ гор. БАКУ.**

**Nömrələrinin qiyməti 1 manatdan beş manata qədərdir və aşpazxanamızda hər cür Asiya və Avropa xörəkləri mövcuddur. İstirahətini sevən müştərilərdən mehmanxanamızı bir dəfə gəlib görmələri rica olunur. Pasroptsuz müsafirlər zəhmət çəkməsinlər, çünki divan hökmünə görə qəbul olunmuyacaqlar Adresimiz: Qubernski küçədə, Lalayevin evində Mehmanxaneyi-"İslamiyyə".**
**Sahibi-mehmanxana: İsmayıl Mahmudzadə.**
**Баку, Губернская ул., номера "ИСЛАМИЯ", телефон 1251.**

TƏZƏ AÇILAN MÜALİCƏXANA

"Тифлисская частная лечебница"

Вокзальная 8, д.Энфиаджианца

Телефонъ 695

İ.Q.Fyodorov - İçəri və uşaq azarının həkimi. Qəbul edir hər gün çaharşənbə və bazardan savayı saat 11-dən 12-dək.

V.D.Qambaşidze - İçəri və uşaq azarı. Hər gün bazardan savayı saat 12-dən 1-dək.

B.A.Popov - Boğaz, burun və qulaq həkimi. Hər gün bazardan savayı saat 12-dən 1-dək.

Q.M.Makarov - İçəri və uşaq azarlarının həkimi. Tək və cümə günləri 1-dən 2-dək.

A.N.Diasamidze - Siflis, dəri və süzənək. Hər gün 11 yarımdan 12 yarımadək.

N.M.Melikov - Cərrahlıq və övrət azarları. Hər gün 1-dən 2-dək.

İ.Q.Qumarteli - İçəri və uşaq azarı. Hər gün 2-dən 3-dək.

V.S.Musxilov - Göz azarı. Hər gün bazardan savayı 2-dən 2 yarımadək.

**Axşamlar**

A.Q.Mirzoyev - İçəri və uşaq azarı. Hər gün bazardan savayı 5-dən 6-dək.

N.Q.Çiçinadze - İçəri və uşaq azarı. Hər gün bazardan savayı 6-dan 7-dək.

Müalicəxanada hər bir azar elm yolu ilə təhqiq olunur, habelə çiçək döyülür və əmzikli övrətlərə də baxılır. Məsləhətə gələnlərdən 50 qəpik alınır.

**iflisdə Mehmanxaneyi-"Dağıstan"**

Nömrələrinin qiyməti yarım manatdan üç manata qədərdir. Hər cür Asiya və Avropa xörəkləri gətirtmək olar. Təmiz və işıq nömrələrimiz çox rahatdırlar.

Pasportsuz qonaqlar zəhmət çəkməsinlər, çünki divan hökmünə görə qəbul olunmuyacaqlar.

Adresimiz: Tiflis, Peskovski küçədə, nömrə 93, təzə müalicəxananın qabağında, konka duran meydanın yanında.

Sahibi mehmanxana: İsa Kərbəlayı Cəfər oğlu gəncəli.

Тифлисъ, Песковская ул., д. № 93, противъ новой лечебницы д-ра Григорьяна номера "ДАГЕСТАНЪ"

**İDARƏMIZDƏ SATILAN KITABLAR**

| Kitabların adları | Yazanlar | Qiymətləri: idarədə | Qiymətləri: poçta xərcilə |
|---|---|---|---|
| Dərs kitabları: | | | |
| Vətən dili, əvvəlinci il üçün dərs kitabı | Çernyayevski | 35 qəp. | 40 qəp. |
| Türk əlifbası | Müəllim M.Mahmudbəyov | 20 qəp. | 24 qəp. |
| Birinci kitab, əvvəlinci il üçün dəsr kitabı | Gəncə müəllimi Mirzə Abbas Mollazadə | 20 qəp. | 24 qəp. |
| Uşaq bağçası, birinci il üçün dəsr kitabı | Rəşidbəy Əfəndizadə | 25 qəp. | 30 qəp. |
| Bəsirətül-ətfal, ikinci il üçün dəsr kitabı | -*--*--*- | 25 qəp. | 30 qəp. |
| Məşq məcmuəsi | Mirzə Abbas Mollazadə | 8 qəp. | 10 qəp. |
| Qiraət kitabları: | | | |
| Təşrihül-fəraiz | Axund Araszadə | 1 man. | 1man. 16 qəp. |
| "Rüstəm və Söhrab" (gözəl şəkilli) | Abbas Ağa Qayıbov | 1 man. | 1man. 20 qəp. |
| Bizə hansı elmlər lazım | Axund Əbuturab mərhum, Ə.Hüseynzadə, Faiq Ne'manzadə və Molla Nəsrəddin | 15 qəp. | 20 qəp. |
| Usta Zeynal (şəkilli) | Molla Nəsrəddin | 15 qəp. | 17 qəp. |
| Qurbanəlibəy (-*-) | -*--*--*- | 15 qəp. | 17 qəp. |
| İranda hürriyyət (-*-) | -*--*--*- | 15 qəp. | 17 qəp. |
| Millət dostları | Haqverdiyev | 5 qəp. | 7 qəp. |
| Şeyx və vəzir (farsca) | Mirzə Mülkümxan | 20 qəp. | 24 qəp. |
| Məbdəi-tərəqqi (farsca) | -*--*--*- | 5 qəp. | 7 qəp. |
| Həqiqəti-islam | Axund Yusif Talıb-zadə | 50 qəp. | 50 qəp. |
| İslam tarixi (birinci hissə) | -*--*--*- | 45 qəp. | 45 qəp. |
| İslam məmləkətlərinin xəritəsi | -*--*--*- | 25 qəp. | 25 qəp. |
| Müəllimüş-şəriə (birinci hissə) | -*--*--*- | 40 qəp. | 40 qəp. |
| Müəllimüş-şəriə (ikinci hissə) | -*--*--*- | 50 qəp. | 50 qəp. |
| İki uşaq | Mirzə Abdulla Talıb-zadə | 20 qəp. | 20 qəp. |
| Qanlı müsadimə | -*--*--*- | 5 qəp. | 5 qəp. |
| Asari Əhmədbəy Cavanşir (milli şe'r məcmuəsi) | -*--*--*- | 25 qəp. | 30 qəp. |

***Şagird dəftərləri: idarədə yüz dənəsi 2 manat 40 qəpik. Nalojnı vasitəsilə istəyənlər hər sifarişə 17 qəpik artıq poçta xərci verəcəklər.***

IV ГОДЪ ИЗДАНИЯ № 15 АПРЕЛЯ 12-ГО 1909г.

# "Молла Насрединъ"

*КОНТОРА и РЕДАКЦИЯ*
журнала
"Молла Насреддинъ"
Тифлисъ
*Давидовская ул., д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКИЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

*ЦѢНА на ГОДЪ*
*Съ доставкою..............5 руб.*
*За границу..................6 руб.*
*ЦѢНА за ОБЪЯВЛЕНИЯ*
*За место занимаемое строкою*
*петита впереди текста .....10 коп.*
*позади " " .....7 коп.*




Möhlət ilə verilir
Bir manatadək
Bir manatadək
Əl maşınları - 25 manatlıqdan başlamış
Rusiyada məhz öz mağazalarımızda satılır.
Tiflisdə üç məxsusi şö'bə var:
1. Qalovinski küçədə, Mirimanovun evində, Sərdar imarətinin qabağında.
2. Vağzal küçəsində, İnficiyansın evində.
3. Avlabarda, Kaxetinski küçədə, Həsən Calalovun evində.
Hökumət tərəfindən təsdiq olunmuş mağaza lövhəsi




Fabrika əlaməti
Saxtalarından ehtiyat edin.

**GRAND PRIX**
**ПАРИЖЪ, 1900 г.**

Dünyada

ə'la qaloşlar




Rus-Amerika rezin manufakturasının şirkəti

ПОДЪ "ТРЕУГОЛЬНИКЪ" ФИРМОЙ

Peterburqda
Malın yaxşılığına zəmanət edirik. Hər yerdə satılır.

Tiflis teatrında faciə oyunu



Vallah, biz elə bildik ki, səhnədə mərsiyə oxunur, yoxsa bu qədər ağlamazdıq.

Kamil Paşa. Əhrar firqəsi və ittihadi - Məhəmmədi əmiyyəti

Кямиль-паша и духовенство.

احرار فرقسی و اتحاد محمدی جمعیتی

کامل پاشا .



Событія 31 марта.
(Константинополь)

İslambulda 31 mart faciəsi